# İmam Həsənin عليه السلام sülhü

## Reallıq və tarixin zülmü



Yəhya Əbdülmuhsin Duxi

**Kitabın adı:** İmam Həsənin (ə) sülhü: reallıq və tarixin zülmü

**Müəllif:** Yəhya Əbdülmuhsin Duxi

**Tərcüməçi**: Ramil Aslanlı

**Dizayn:** Xəlil Məmmədov

İslam tarixinə dair ən böyük təhrif, yalan və hiyləgərliklərin altında Əməvi sülaləsinin imzası olduğunu desək, şübhəsiz ki, yanılmış olmarıq. Allahın kitabına, Peyğəmbərin (s.ə.a) buyuruqlarına baxmayaraq, öz nəfsi istəklərini min bir hiylə ilə gerçəkləşdirməkdə israrlı olan Müaviyə ibn Əbu Süfyan Əməvi nümayəndələri arasında İslama ən ciddi zərbəni vuranların başında gəlir. Əlinizdəki bu kitab, onun cənnət cavanlarının ağası İmam Həsən (ə) ilə bağladığı sülhün həqiqətlərini işıq üzünə çıxarır. Həqiqətin gün kimi aydın olmasına baxmayaraq, bəzi alimlərin bu tarixi faktları görməzdən gəlmələri də ayrı bir problemdir. Ümid edirik ki, kitabı oxumaqla kifayətlənməyib, dostlarınızla da paylaşacaqsınız. Axı kitab həm də paylaşmaq üçündür...

**MÜNDƏRİCAT**

# GİRİŞ

Əgər İmam Həsənin (əleyhissalam) bağladığı sülhün islam ümmətinin həyatında tarixi dönüş nöqtəsi oynadığı qədər əhəmiyyətli olduğunu desək, mübaliğə etmiş olmarıq. Bu sülh əməvi xəttinin törətdiyi hadisələrə qarşı müsəlmanların zehinlərində fəhm və idrak baxımından yeni mərhələnin yaranmasını formalaşdırdı. İmam Həsən (əleyhissalam) bağladığı sülhün sayəsində Peyğəmbərin uğrunda qiymətli qurbanlar verdiyi dinin təhrif olunmasına və ali dəyərlərin aradan getməsinə səbəb olacaq fırtınaların qarşısını aldı.

Bu tarixi hadisənin böyük əhəmiyyətinə baxmayaraq, təəssüflər olsun ki, tarixçilər insaf və obyektivliklə bu hadisəni izah etməmişlər. Bu hadisə bəzən yarımçıq, bəzən isə tərsinə təsvir edilmişdi. Nəticədə bu tarixi hadisə detalları ilə aydın olmamış, həqiqəti tam ehtiva etmədən, qarışıq formada təsvir edilmişdir.

Belə bir halda bu sülhün mahiyyəti və ona bağlı baş vermiş hadisələr barəsində müəyyən şübhələrin yaradılması olduqca təbiidir. Məhz bu səbəbdən həmin sülhün səbəblərini, nəticələrini və faydalarını araşdırmaq, o cümlədən onun ətrafında yaradılmış bəzi şübhələri dəf etmək üçün bu kitab ərsəyə gəlmişdi. Baş vermiş hadisələrin elmi araşdırılması üçün tədqiqatçı, ustad Yəhya Əbdulmuhsin Duxi əlini “yaranın” üzərinə qoymuşdur. Kitabda bəzi tarixi mətnləri, rəvayətləri toplamış, həqiqəti öz yerinə qoymaq üçün onları müfəssəl təhlil etmişdir.

Həcc və ziyarət institutu əziz ustada sərf etdiyi zəhmət müqabilində öz dərin minnətdarlığını bildirir. Allah-təaldan onun bu əməlini qəbul etməsini diləyir və bu araşdırmaların ehtiva etdiyi həqiqətlərin ümmətin vəhdətinə carçı olmasını, Allah-təalanın pak etdiyi əhli-beytin ətrafında cəm etməsini istəyir.

Allah-təala müvəffəqiyyətin zaminidir.

Həcc və ziyarət institutu

Kəlam və bilgilər şöbəsi

# MÜQƏDDİMƏ

İslam tarixini formalaşdıran hadisələrin bir çoxunun müsəlmanlar üçün əhəmiyyətli və həssas olmasına baxmayaraq, üzərinə qaranlıq və anlaşılmazlıq çökdürülmüşdür. Bəlkə də bu hadisələrdən biri də, İmam Həsənin (əleyhissalam) sülhüdür. Tarix bu hadisənin üzərinə örtük çəkmişdir. Əgər bu örtük götürülsə və hadisə çılpaqlığı ilə aşkar olsa, bir çoxları tərəfdən haqsız yerə yürüdülən hökmlər dəyişər.

Biz bu işi görənləri mühakimə etmək məqsədində deyilik, sadəcə olaraq tarixi hadisənin həqiqətini bilmək istəyirik. Məsələn, Təbəri Müaviyə ilə bağlanmış sülh müqaviləsi barədə danışarkən elə bir söz nəql etməklə kifayətlənmişdir ki, sanki Müaviyə İmam Həsənlə (əleyhissalam) bütün şərtlərini qəbul etməyə hazır imiş. Təbəri yazır: **“Müaviyə Həsənə sonunda möhürlü bir ağ səhifə göndərdi və ona belə yazdı: “Sonunda möhür vurduğum bu səhifədə istədiyin şərti yaza bilərsən”.**[1]

Sonra sözü yarımçıq qoyaraq İmam Həsənin (əleyhissalam) Müaviyəyə həmin səhifədə nə yazdığını qeyd etmir.

Sülhün bəndlərini və şərtlərini qeyd edən tarixi mənbələri araşdıran hər bir şəxs bu əhəmiyyətli tarixi hadisənin mətni barədə çox az bir şeyin yazıldığına şahid olar.

Həmçinin hədis alimlərində də bunun eynisini görürük. Məsələn, Zəhəbi bu hadisəni Həsən əl-Bəsrinin Əbu Musadan nəql etdiyi rəvayəti qeyd etməklə kifayətlənmişdir:

**“Həsən bin Əli Müaviyəni dağlar qədər olan ordu ilə qarşıladı. Əmr bin As dedi: “Allaha and olsun, elə ordu görürəm ki, o öz mislində ordunu qətlə yetirməyincə geri dönməz. Müaviyə - iki kişinin ən xeyirlisi idi - dedi: “Əgər bunlar bir-birini qətlə yetirərsə, onların övladlarını, mülklərini, qadınlarını nə edəcəm?”. Sonra Əbdürrəhman bin Sumrəni (elçi olaraq qarşı tərəfə) göndərdi. Bundan sonra Həsən Müaviyə ilə sülh bağladı”.**[2]

Burada İmam Həsənin (əleyhissalam) tarixinin və Müaviyə ilə bağlanmış sülhdə yerinə yetirdiyi rolunun tamamilə ixtisar olunduğunu görürük.

O Müaviyə ki, Əqqad onun siyasətini şərh edərkən deyir:

---

[1] Tarixut-Təbəri, c.4, səh. 124.
[2] Zəhəbi, “Tarixu İslam”, c.4, səh. 38.

**“Onun dəfələrlə ustalıqla yerinə yetirdiyi hiylələri vardı. Müsəlman və qeyri-müsəlmanlardan olan rəqiblərinə qarşı hiylələrindən istifadə edirdi. Onun siyasətinin ana xətti rəqibinin içərisində şübhə toxumu səpmək, kin-küdurət yaratmaqla təfriqə salmaq və bir-birini satmaq üçün qüvvə sərf etmək idi. Hətta öz ailəsi və qohumlarına qarşı belə edirdi. İki insanın bir işdə müttəfiq olmasını xətərli hesab edirdi. Əgər o, öz dövlətində hökumət adamlarının arasında bir-birinə qarşı müxalif olan partiya yaratmaq iqtidarında olsaydı, elə belə də edərdi. Əgər tarix ona düzgün qiymət versəydi, onu insanlar arasında təfriqə salan şəxs kimi səciyyələndirərdi”.**[3]

Deməli, Müaviyənin siyasəti hiylə, təfriqə, kin-küdurət yaratmaq üzərində formalaşmışdı. Əgər tarix onu düzgün dəyərləndirsə, Əqqadın dediyi kimi, onu insanlar arasında təfriqə yaradan şəxs olaraq səciyyələndirərdi.

Bütün bunlara baxmayaraq, görürük ki, Zəhəbi bu dövrü az qala beş sətirdən ibarət sözlərlə ixtisar edərək kiçik bir boxça düzəltmişdir. Bu sözləri araşdıran təəccüblənməyə bilməz. İki kişinin ən xeyirlisi Müaviyə İmam Həsənlə (əleyhissalam) savaşacağı təqdirdə onun yetim qalacaq uşaqlar və dul olacaq qadınlarının halına acıyır!

Əmr bin As üzərlərinə böyük ordunun gəldiyini deyir. Onda soruşuruq: Sayı çox olan dağlar boyda ordu ilə yanaşı hansı səbəblər sülh bağlamağa gətirib çıxardı?

Həmin zaman ərəfəsində hadisələr necə cərayan etdi ki, İmam (əleyhissalam) Əbdürrəhman bin Sumrənin gətirdiyi təklifi qəbul edərək xilafəti Müaviyəyə təhvil verdi?

Təəssüflər olsun ki, belə rəvayətləri nəql edib ona etimad edənlər vardı. Misal olaraq, Heytəminin “Səvaiqul-muhriqa” kitabında dediyini qeyd edirik:

**“Altı aydan sonra (İmam Həsən) 40 minlik qoşunla Müaviyənin üzərinə yürüş etdi. İki qoşun üz-üzə gəldikdə Həsən bildi ki, çoxlu sayda insan qətlə yetirilməyincə iki qoşundan heç biri digərinə qalib gəlməyəcək. Buna görə də Müaviyəyə xilafəti ona təhvil vermək barədə məktub yazdı. Bu şərtlə ki, ondan sonra xilafət onun olmalı, atasının vaxtında Mədinə, Hicaz və İraqda insanlara verilən əmlak heç kimin əlindən alınmamalı və onun borcları ödənilməlidir. Müaviyə sonuncudan başqa onun bütün tələblərini qəbul etdi. (İmam Həsən) ona dəfələrlə müraciət etdikdən sonra Müaviyə ona ağ bir dəri**

---

[3] Əqqad, “Müaviyə”, səh. 36-37.

**(səhifə) göndərib dedi: "İstədiyini yaz! Sən deyənlərə razı olacam". Tarix kitablarında belə yazılıb".**[4]

İbn Həcərin nəql etdiyi tarix kitabları belədir. Təəssüflər olsun ki, ondan sonra gələnlərin onun obyektivlikdən uzaq olan bu nəqlinə etimad etdiklərini görürük. Halbuki o, tarixə qarşı cinayət işlətmiş, sülhün və xilafətin, ümmətə başçılıq etməyi Müaviyəyə təhvil verilməsinin məsuliyyətini İmam Həsənin (əleyhissalam) üzərinə atmışdır. İmam Həsən (əleyhissalam) müharibənin məsuliyyətindən yayınmaq üçün sanki hakimiyyətdən kənar olmaq istəyir. Çünki o, hərbdən çox sülhə rəğbət bəsləyir.

Lakin bu bəhanə qəti olaraq batildir. Çünki İmam Həsənin (əleyhissalam) hərb meydanındakı mövqeləri onun qəhrəmanlığına və şücaətinə dəlildir. Kamil Süleyman belə deyir:

**"O, atasının döyüşlərində əsas sütunlardan və ordusunun əmiri idi. O, atasının sağ qolu və ən böyük köməkçisi idi. Əbu Turab hücum edəndə övladları da onunla birgə hücum edir, ona kömək edir, ona arxa-dayaq olurdular. Onların hamısı hücum edən aslan kimi idi".**[5]

İmam Həsənin (əleyhissalam) Cəməl və digər döyüşlərdəki mövqeləri bu sözün doğruluğunu təsdiq edir. İbn Şəhr Aşub belə nəql edir:

**"Cəməl döyüşü günü möminlərin əmiri Əli (əleyhissalam) Muhəmməd bin Hənəfiyyəni yanına çağıraraq nizəsini ona verib buyurdu: "Bu nizəni dəvənin köksünə sanc!" Bənu Zəbbə ona imkan vermədilər. Atasına tərəf geri dönəndə İmam Həsən nizəni onun əlindən aldı və dəvəyə tərəf hücum elədi. Atasının yanına qayıtdıqda nizənin ucunda qan var idi. Əmirəlmöminin (əleyhissalam) Muhəmmədə dedi: "Hüzünlənmə! O, Peyğəmbərin oğlu, sən isə Əlinin oğlusan".**[6]

Peyğəmbərin (səlləllahu əleyhi və alihi və səlləm) övladı qoşundan qorxmayaraq həmin döyüşün rəmzi olan dəvəni məhv etmək üçün şücaətlə irəli atılmışdı. Deməli, tarix bəşər tarixində əhəmiyyətli olan bu hadisədə İmam Həsənə (əleyhissalam) qarşı ədalət və insafla davranmamışdı. Məhz buna görə də bu tarixi hadisədə baş verənləri işıqlandırmaq üçün üç fəsilə bölərək araşdıracağıq.

Birinci: İmam Həsənin (əleyhissalam) hayatı, xəlifəliyi və imaməti dövrü.

İkinci: Sülh müqaviləsi, səbəbləri və nəticələri.

---

[4] İbn Həcər Heytəmi, "əs-Səvaiqul-muhriqə", c.2, səh.398.
[5] Kamil Süleyman, "Həsən bin Əli", səh.35.
[6] İbn Şəhr Aşub, "Mənaqib Ali Əbu Talib", c.3, səh. 185.

# BİRİNCİ FƏSİL

# İMAM HƏSƏNİN (əleyhissalam) HƏYATI

## Nəsəbi...

Həsən bin Əli bin Əbu Talib bin Əbdülmüttəlib bin Haşim bin Əbdumanaf. İmam, Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) gül ətirli çiçəyi, nəvəsi, Cənnət cavanlarının ağası, Əbu Muhəmməd Haşimi, əl-Mədəni, əş-Şəhid...[7]

O, Əhli-beyt imamlarının ikincisi, Peyğəmbərin ən birinci nəvəsi, Əba əhlinin beşincisidir. Anası Fatimə binti Rəsulullah (sələllahu əleyhi və alihi və səlləm) bütün dünya qadınlarının xanımıdır.[8]

## Dünyaya gəlməsi və Peyğəmbərə (səlləllahu əleyhi və alihi və səlləm) oxşaması

İbn Səd ibn Burqinin dediyinə əsasən o həzrət hicrətin üçüncü ili, ramazan ayının ortasında dünyaya gəlmişdi.[9]

Seyid Muhsin Əmin deyib:

**"Şiə və sünni məzhəblərində məşhur rəyə görə, İmam Həsən ramazan ayının yarısı gecəsi Mədinədə dünyaya gəlib. Şəbanda da doğulduğu deyilmişdir. Bəlkə də qardaşı İmam Hüseynin (əleyhissalam) hicrətin ikinci və ya üçüncü ilində şaban ayında doğulması ilə səhv salıblar. Başqa tarixlər də deyilib. Lakin bu iki tarix arasında məşhur olanı doğrudur".**[10]

Onun mübarək doğum günü Rəsulullah (səllallahu əleyhi və alihi və səlləm) əqiqə qurbanı kəsdi, saçının ağırlığı qədər fəqirlərə sədəqə payladı. Əbu Rafenin belə dediyi nəql olunur:

**"Fatimə Həsəni dünyaya gətirəndə dedi: "Ya Rəsulullah, oğlumun adından qurban kəsimmi?" Peyğəmbər buyurdu: "Yox. Lakin saçını kəs və onun ağırlığında fəqirlərə gümüş (pul) sədəqə ver". Fatimə: "Mən də elə etdim" –dedi".**[11]

---

[7] Zəhəbi, "Siyəru əlamun-nubəla", c.3, səh.246.
[8] Muhsin Əmin, "Əyanuş-şiə", c.1, səh.562.
[9] İbn Həcər Əsqəlani, "əl-İsabə", c.2, səh.60.
[10] Muhsin Əmin, "Əyanuş-şiə", c.1, səh.562.
[11] İbn Həcər Əsqalani, "əl-İsabə", c.2. səh.60.

İbn Abbas belə nəql edir:

**"Rəsulullah (sələllahu əleyhi və alihi və səlləm) Həsən və Hüseynin hər birinin adından əqiqə olaraq keçi kəsdi".**[12]

Onun Rəsulullaha bənzəməsinə gəlincə, İbn Həcər Əsqəlani Abdullah bin Zübeyrdən belə nəql edir:

**"Mən sizə ailəsində ona (Peyğəmbərə) oxşayan və onun üçün ən sevimli olan şəxs barədə danışacam. O, Həsən bin Əlidir. Onu (Peyğəmbərin yanına) gələndə görürdüm. (Peyğəmbər) səcdədə idi. O, Peyğəmbərin boynuna və ya belinə minərdi. O düşməyincə Peyğəmbər onu düşürtməzdi. (Peyğəmbər) ruku edəndə onun yanına gələrdi, ayaqlarının arasından girib digər tərəfindən çıxardı".**[13]

Zəhəbi deyir: **"O, babası Rəsulullaha (səllallahu əleyhi və alihi və səlləm) bənzəyirdi".**[14]

**Fəzilətləri**

Kim Həsən və Hüseyni sevərsə, Peyğəmbəri sevmiş, kim onlara nifrət edərsə, Peyğəmbərə nifrət etmişdir.

Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) övladları Həsən (əleyhissalam) və Hüseynə (əleyhissalam) məhəbbəti ən yüksək zirvədə idi. Bu məhəbbət təkcə onun duyğularından yaranmırdı. Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) ona olan məhəbbət və nifrəti Allah-təalaya da aid etmişdir. Çünki onları sevən Allah-təalanı sevər, onlara nifrət edən Allah-təalaya nifrət etmiş olar.

İbn Həcər Əbu Hureyrənin belə dediyini nəql edir:

**"Bir gün Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) Həsən və Hüseynlə birlikdə evindən çıxdı. Hər birini çiynində oturtmuş, gah onun, gah da bu birisinin üzündən öpə-öpə yanımıza gəldi və buyurdu: "Kim onları sevərsə, məni sevmişdir. Kim onlara nifrət edərsə, mənə nifrət etmişdir".**[15]

Şeyx Mufid Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) belə buyurduğunu nəql edir:

---

[12] Zəhəbi, "Siyəru əlamun-nubala", c.3, səh.62.
[13] Zəhəbi, "Siyəru əlamun-nubala", c.3, səh.62. İbn Həcər Əsqalani, "əl-İsabə", c.2. səh.60.
[14] Zəhəbi, "Siyəru əlamun-nubala", c.3, səh.246.
[15] İbn Həcər Əsqalani, "əl-İsabə", c.2. səh.62.

**“Kim Həsən (əleyhissalam) və Hüseyni (əleyhissalam) sevərsə, mən də onu sevərəm. Mən kimi səvərəmsə, Allah da onu sevər. Allah-təala kimi sevərsə, onu cənnətə daxil etdirər. Kim onlara nifrət edərsə, mən də ona nifrət edərəm. Mən kimə nifrət edərəmsə, Allah-təala da ona nifrət edər. Allah kimə nifrət edərsə, əbədi olaraq onu cəhənnəm oduna vasil edər”.**[16]

Həmçinin Züheyr bin Əqmər belə nəql edir:

**“Əlinin (əleyhissalam) qətlindən sonra Həsən bin Əli (əleyhissalam) xütbə etdiyi zaman Əzd qəbiləsindən olan bir hündürboy adam ayağa qalxıb dedi: “Mən Peyğəmbərin (sələllahu əleyhi və alihi və sələm) bunu çiyni üzərinə qaldırıb belə buyurduğunu eşitmişəm: “Kim məni sevirsə, bunu da sevsin. Bu xəbəri eşidən eşitməyənə çatdırsın”**.[17]

Tirmizi Üsamə bin Zeydin nəql etdiyi bu hədisi “həsən” hədis hesab etmişdi:

**“Bir gecə Peyğəmbər (c) qucağında bükülü bir şeylə gəldi. Mən: “Bu nədir?” deyə soruşdum. Örtüyü açdıqda Həsən və Hüseyni onun qucağında gördüm. (Peyğəmbər) buyurdu: “Bu ikisi mənim və qızımın övladlarıdır. İlahi, mən onları sevirəm, Sən də onları və onları sevəni sev!”**[18]

Heç kimə gizli deyil ki, Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) nəsli Həsən (əleyhissalam) və Hüseynlə (əleyhissalam) davam etmişdir. Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) Nəcran xristianları ilə mübahələ etdiyi zaman o həzrətin yanında olan dörd nəfərdən ikisi onlar idi. Hakim belə nəql edir:

**“Təfsir kitablarında qeyd olunan hədislərdə mütavatir olaraq Abdullah ibn Abbas və qeyrilərindən nəql edilir ki, Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) mübahilə günü Əlinin, Həsənin və Hüseynin əlində tutub arxalarınca da Fatimə dayandı. Sonra (Peyğəmbər) buyurdu: “Bunlar bizim övladlarımız, özümüz və qadınlarımızdı. Siz də özünüz, övladlarınız və qadınlarınızı gətirin. Sonra Allaha dua edək ki, yalançılara lənət eləsin”.**[19]

İmam Həsən (əleyhissalam) təthir ayəsinə əsasən çirkinliklərdən təmizlənmiş pak məsumlardandır. Allah-təala buyurub: **“Həqiqətən Allah (xüsusi yaradılış iradəsi ilə) siz (Peyğəmbərin) Əhli-beytindən hər cür pisliyi təmizləmək və sizi – paklığın bütün cəhətlərində – pak etmək istəyir ”** (Əhzab surəsi, ayə 33).

---

[16] Şeyx Mufid, “əl-İrşad”, c.2, səh.28.
[17] İbn Həcər Əsqalani, “əl-İsabə”, c.3. səh.251.
[18] Zəhəbi, “Siyəru əlamun-nubala”, c.3, səh.246.
[19] Hakim Nişapuri, “Mərifətu ulumil-hədis”, səh.50.

O həzrət Allahın onları sevməyi əmr etdiyi (Peyğəmbərin) qohum-əqrabasındandır. Allah-təala buyurub: **“De: “Sizin bunun (ilahi tapşırıqların çatdırılmasının) müqabilində qohumlarım barəsində (qəlb və əməldə) məhəbbətdən başqa bir muzd istəmirəm”...”** (Şura surəsi, ayə 23).

O, Peyğəmbərin qoyub getdiyi iki əmanətdən biridir ki, kim onlardan yapışsa nicat tapar, kim onlara arxa çevirsə haqdan azar. Müslim bin Həccac Nişapuri “Səhih”ində Zeyd bin Ərqəmdən Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) belə buyurduğunu nəql edir:

**“Mən sizin üçün iki əmanət qoyub gedirəm. Onların birincisi Allahın kitabıdır. Orada hidayət və nur var. Allahın kitabına sarılın və ona əməl edin”. Sonra belə buyurdu: “(İkinci əmanət isə) Əhli-beytimdir. Əhli-beytim barəsində sizə Allahı xatırladıram, Əhli-beytim barəsində sizə Allahı xatırladıram, Əhli-beytim barəsində sizə Allahı xatırladıram...”**[20]

Əhməd bin Hənbəlin “Müsnəd” kitabında belə yazılıb:

**“Mən sizin aranızda iki xəlifə qoyub gedirəm. Yerlə göy arasında uzanmış Allahın ipi olan Allah kitabını və Əhli-beytimi. Onlar (qiyamət günü) hovuz başında mənim yanıma gələnədək bir-birindən ayrılmayacaq”**.[21]

## İMAM HƏSƏNİN XƏLİFƏLİYİ VƏ İMAMLIĞI

Sülhün mahiyyətini, baş vermə səbəblərini və nəticələrini izah etməyə başlamadan əvvəl İmam Həsənin (əleyhissalam) xəlifəliyinin həvayi-nəfsindən danışmayan, dediyi hər sözü vəhy olan Peyğəmbər (sələllahu əleyhi və alihi və səlləm) tərəfindən təyin olunmasını bəyan edək. İnsanlar beyət etsə də, etməsə də, o həzrət həqiqətən şəri xəlifədir. Onun bütün hərəkətləri və etdiyi işlər haqq çərçivəsindən kənar deyil. Ümmətə ona itaət etmək vacib, onun əmrlərindən yayınmaq isə qadağandır. Peyğəmbərin (sələllahu əleyhi və alihi və səlləm) və Əmirəlmöminin Əlinin (əleyhissalam) müjdə verdiyi hədislərə qarşı cıxmağa nə Müaviyənin, nə də qeyrisinin haqqı yoxdur. Həmin hədislərə misal olara Buxarinin “Səhih”ində “kitabul-əhkam” bölməsində Cabir bin Sumrədən nəql etdiyi hədisi qeyd edə bilərik. Cabir bin Sumrə belə nəql edir:

**“Peyğəmbərin (sələllahu əleyhi və alihi və səlləm) belə buyurduğunu eşitdim: “On iki əmir olacaq”. Sonra bir söz dedi, lakin mən eşitmədim. Atam mənə Peyğəmbərin “Hamısı Qureyşdəndir” buyurduğunu dedi”.**[22]

---

[20] Müslim Nişapuri, “Səhih”, c.7, səh.123.
[21] Əhməd bin Hənbəl, “Müsnəd”, c.5, səh.182.

Bu imamların hamısı Qureyşdən olmalıdır. Dəqiqliklə desək, Bəni-Haşimdən olmalıdır. Necə ki, Əbdülməlik bin Ümeyr Cabir bin Sumrənin belə dediyini nəql edir:

**“Atamla Rəsulullahın (sələllahu əleyhi və alihi və səlləm) yanında idik. Onun belə dediyini eşitdim: “Məndən sonra on iki xəlifə olacaq”. Sonra səsini qısdı. Mən atamdan “Səsini qısarkən nə dedi? - deyə soruşdum. Atam (Peyğəmbərin): “Hamısı Bəni-Haşimdən olacaq” söylədiyini dedi”**.[23]

Zəhəbinin[24] şeyxi Cüveyninin Cabir bin Abdullah Ənsarinin “Səhifətu-Fatimə” (Fatimənin səhifəsi) barədə nəql etdiyi hədisdə Peyğəmbər (sələllahu əleyhi və alihi və səlləm) tərəfindən bu hədisin izahı bəyan edilmişdi. Belə ki, həmin hədisdə Peyğəmbər (sələllahu əleyhi və alihi və səlləm) bir-bir onların adlarını qeyd etmiş və imamlıqlarını[25] təyin etmişdir.

Həmçinin, hədislərdə Peyğəmbərin (sələllahu əleyhi və alihi və səlləm) belə buyurduğu nəql edilir:

**“Həsən və Hüseyn qiyam etsələr də, etməsələr də, imamdırlar”.**[26]

Peyğəmbər (sələllahu əleyhi və alihi və səlləm) cihad etsələr də, etməsələr də, insanları itaətlərinə dəvət etsələr də, etməsələr də, onların qeyd-şərtsiz imam olmalarını vacib bilmişdir.

---

[22] Səhih Buxari, c. 8, səh. 128. Bu hədisin şiənin etiqad etdiyi 12 imamdan başqa düzgün tətbiqi yoxdur. Buna görə də əhli-sünnə alimləri bu hədisin düzgün təfsiri üçün bir çox yozumlara baş vurmuş və böyük xətaya düşmüşlər. Şeyx Mahmud Əbu Rəyya Süyutinin dediklərinə fikir bildirərkən deyir: *“Süyutiyə gəlincə, o, düzgün izah olunmayan bu hədis barədə əhli-sünnə alimlərinin rəylərini qeyd etdikdən sonra çox qəribə bir rəy söyləyir. Oxucuların könüllərinin açılması üçün burada həmin rəyi qeyd edirik: “Buna əsasən də dörd xəlifə on iki nəfərdəndir. Həsən, Müaviyə, İbn Zübeyr və Ömər bin Əbdüləzizi də əlavə etsək səkkiz nəfər olur. Məhdi Abbasinin də onlarla birlikdə olması ehtimal olunur. Çünki o, abbasilər içərisində Ömər bin Əbdüləzizin əməvilər içərisində olduğu kimidir. Həmçinin zahirə əsasən o, ədalət məziyyətinə sahib idi. İki gözlənilən şəxs qaldı. Biri Məhdidir. Çünki o, Muhəmmədin (s) əhli-beytindəndir. İkinci gözlənilən şəxsi isə qeyd etməmişdir”.* (Mahmud Əbu Rəyya, “Əzva alə əs-sunnə ən-nəbəviyyə”, c. 2, səh. 31.)

[23] Qunduzi Hənəfi, “Yənabiul-məvəddə”, c. 2, səh. 315.
Qundizinin tərcümeyi-halı: *“O, Süleyman bin Xacə İbrahim Qablan əl-Hüseyni əl-Hənəfi əl-Qundizidir. Bəlx şəhərində doğulub və Konstantinapol şəhərində vəfat edib. Onun Peyğəmbər (s) və Əhli-beytinin fəzilətləri barəsində “Yənabiul-məvəddə” əsəri var.”* Bax; Zərkəli, “əl-Əlam”, c. 3, səh. 125.

[24] Zəhəbinin tərcümeyi-halında onun şeyxləri barəsində danışarkən Cüveyninin şagirdi olduğu qeyd olunur. Bunun çox əhəmiyyəti var. Çünki çox zaman onu şiəlikdə ittiham edirlər. Bu, ona qarşı heç bir əsası olmayan puç ittihamdır. Təəssübkeş Zəhəbi onun yanında şagird olur, onu tərifləyir, böyük imam, şeyxlər şeyxi və din sahibi deyə onu vəsf edərək deyir: *“İbrahim bin Muhəmməd bin Muəyyəd bin Abdullah bin Əli bin Muhəmməd bin Həməviyə, böyük imam, mühəddis, şeyxlər şeyxi, dinin başçısı, bütün elmləri özündə cəm edən Xorasani Cüveyni Sufi. Xorasanda, Bağdadda, Şamda və Hicazda tanınmışdır. O, bu elmə böyük diqqət yetirən idi”.* “Təzkirətul-huffaz” kitabında belə deyir: *“İmam, mühəddis, kamil, İslamın fəxri, dinin başçısı, İbrahim bin Muhəmməd bin Muəyyəd bin Həməviyə əl-Xorasani əl-Cüveyni. Sufiərin şeyxi. Hədis nəql etməyə, gözəl qiraətə həddindən çox diqqət edən, xoşüzlü, heybətli, dindar və əməlisaleh biri idi. Hicri 722-ci ildə vəfat etmişdir”.* Bax; “Möcəmu şuyuxi Zəhəbi”, c. 1, səh. 50; “Təzkirətul-huffaz”, c. 4, səh. 1506.

[25] əl-Cüveyni əş-Şafei, “Fəraidus-simteyn”, c. 2, səh. 136-141; əl-Kuleyni, “əl-Kafi”, c. 1, səh. 527,528.

[26] Şeyx Mufid, “əl-İrşad”, c.2, səh. 30; Şərif Murtəza, “əl-Fusulul-muxtarə”, s. 303; Əhli-sünnə yolu ilə Movləvi Siddiq Həsən Xan Qənuci bu hədisi nəql etmişdir. Bax; Seyid Hamid Nəqəvi, “Xülasətu əqəbatil-ənvar”, c.4, səh. 304.

Peyğəmbər (sələllahu əleyhi və alihi və səlləm) İmam Hüseynə (əleyhissalam) buyurub: **"Sən İmamsan, imam oğlusan, imam qardaşısan".**[27]

Həmçinin, ona və qardaşı Hüseynə (əleyhissalam) buyurmuşdur: **"Siz ikiniz də imamsınız və şəfaət ananıza məxsusdur".**[28]

Atası əmirəlmöminin Əli (əleyhissalam) onu insanlara imam camaatlıq etməyi tapşırdı və vəfat edərkən ona vəsiyyət edərək buyurdu:

**"Ey oğlum, Rəsulullah sənə vəsiyyət etməyi mənə əmr etmişdi. Rəsulullah mənə vəsiyyət edərək kitablarını (yazıların) və silahını verdiyi kimi mənim də sənə kitablarımı və silahımı verməyi əmr etdi. Mənə əmr etdi ki, ölüm sənə yetişdikdə sən də bunları qardaşın Hüseynə verəsən...". Sonra oğlu Həsənə yaxınlaşıb buyurdu: "Sən xilafətin və qisasın sahibisən".**[29]

Rəsulullahın (sələllahu əleyhi və alihi və səlləm) Əmirəlmöminin Əliyə (əleyhissalam) vəsiyyəti onun imamlığına dəlalət etdiyi kimi, Əmirəlmöminin Həsənə (əleyhissalam) vəsiyyəti də onun imamlığına dəlalət edir. Deməli, onun imamlığı və xilafətinə dəlalət edən hədislər aşkar və aydındır. İndi də araşdırmanın davamı olaraq İmam Həsənin (əleyhissalam) beyəti məsələsinə keçirik.

## İMAM HƏSƏNƏ (əleyhissalam) BEYƏT EDİLMƏSİ[30]

İmam Həsənin (əleyhissalam) ümmətə xitab etdiyi söz Əmirəlmöminin Əlinin (əleyhissalam) dəfnindən və onu pak qəbrinə qoyduqdan sonra olmuşdur. Abdullah bin Abbas[31] insanların qarşısına çıxıb dedi:

**"Əmirəlmöminin artıq vəfat etmişdir. O, sizin aranızda öz xələfini qoyub getmişdir. İstəsəniz sizin qarşınıza çıxar. Əgər istəməsəniz heç kimin öhdəsində kiminsə haqqı olmaz". Camaat ağlayaraq "Gəlsin bizim yanımıza"[32] - dedilər.**

İmam Həsən (əleyhissalam) insanların qarşısına çıxıb Allaha həmd və səna söylədikdən sonra buyurdu:

---

[27] Şeyx Tusi, "ər-Rəsail əl-Əşərə", səh. 98. Seyid Hamid Nəqəvi, "Xülasətu əqəbatil-ənvar", c.4, səh. 304.
[28] İbn Səbbağ, "əl-Fusulul-muhimmə fi mərifətil-əimmə", c.1, səh. 666; Ərbili, "Kəşful-ğummə", c. 2, səh. 129.
[29] Kuleyni, "əl-Kafi", c. 1, səh. 298,299.
[30] İnsanların imama beyət etməsi onun imamlığına dəlalət etməz. Peyğəmbər hədislərinin təyin etdiyi şəxsə insanların beyət etməsi vacibdir. İmamiyyəyə əsasən, ondan başqasına beyət etmək düzgün deyil. Yalnız zəruri hal istisnadır. Zəmanənin şərtlərinə əsasən iki imamdan – İmam Əli (ə) və İmam Həsəndən (ə) başqa hədisin təyin etdiyi digər imamlara insanlar beyət etməmişlər. (Bax; Ali Razi, "Sülhul-Həsən", cəh. 54.)
[31] Daha doğrusu, Übeydullah bin Abbas olmuşdur. Çünki Abdullah bin Abbas Məkkədə idi. Hər ikisinin atabir qardaş olması güman edilir. Adlarının yazılışı oxşar olduğu üçün onları bəzən səhv salırlar. Bax; Ali Razi, "Sülhul-Həsən", cəh. 105.
[32] İbn Əbilhədid, "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 22.

**“Bu gecə elə bir şəxs vəfat etmişdir ki, saleh əməllər etməkdə nə əvvəlkilər ondan öndə olmuş, nə də sonra gələnlər ondan önə keçə bilərlər. Rəsulullah (sələllahu əleyhi və alihi və səlləm) bayrağı ona verər və o, Cəbrail sağ tərəfində, Mikail isə sol tərəfində olduğu halda savaşardı. Allah onun əli ilə fəth bəxş etməyincə geri dönməzdi.**[33] **O, ona düşən 700 dirhəmdən savayı yer üzərində nə qızıl, nə də gümüş qoyub getdi. Bu pul ilə ailəsinə xidmətçi almaq istəyirdi”.** Sonra belə buyurdu: **“Ey insanlar! Məni tanıyan tanıyır. Kim məni tanımırsa, bilsin ki, mən Həsən bin Əliyəm. Mən Peyğəmbərin övladıyam. Məni (Rəsulullahın) vəsiyyət etdiyi şəxsin oğluyam. Mən müjdə verənin oğluyam. Mən xəbərdar edənin oğluyam. Mən Allahın izni ilə Onun yoluna dəvət edənin oğluyam. Mən yanar çırağın oğluyam. Mən Əhli-beytdənəm. O Əhli-beyt ki, Cəbrail bizə nazil olar və bizdən yüksəlib gedərdi. Mən Allahın bütün çirkinliklərdən pak etdiyi əhli-beytdənəm. Mən onları sevməyin hər bir müsəlmana vacib etdiyi əhli-beytdənəm. Allah-təala buyurmuşdur: “De: “Sizin bunun (ilahi tapşırıqların çatdırılmasının) müqabilində qohumlarım barəsində (qəlb və əməldə) məhəbbətdən başqa bir muzd istəmirəm. Kim bir yaxşı iş görərsə, Biz onun üçün həmin işdə yaxşılıq artırarıq.”** (Şura surəsi, ayə 23). **Yaxşı iş biz Əhli-beytin məhəbbətidir.**[34]

Sonra İmam əyləşdi. Abdullah bin Abbas onun qarşısında ayağa qalxıb dedi: **“Ey insanlar! Bu, sizin Peyğəmbərinizin oğlu və imamınızın vəsiyyət etdiyi şəxsdir. İnsanlar ona beyət etmiş və dəvətini qəbul etmişlər”. İnsanlar dedilər: “O, bizim üçün ən sevimli və haqqı bizə ən vacib olandır”. Sonra insanlar hamılıqla ona beyət etməyə başladılar. Həmin gün hicrətin 41-ci ili ramazan ayının 21-i, cümə günü idi.**[35]

Ümmət ona beyət etdikdən sonra çox bəlağətli bir xitab söylədi. Belə ki, hər bir işi öz doğru yerində söylədi. İnsanlara Ali-Muhəmmədin şəri haqq sahibləri, onların siratəl-mustəqim, Allahın qalib gələn dəstəsi, Rəsulullahın ailəsi, ona başqalarından daha yaxın olmaları və onlara itaət etməyin vacibliyi barədə höccəti tamamladı. Sonra insanları Şeytanın (məqsədi Müaviyə idi) səsinə qulaq asmaqdan çəkindirib ehtiyatlı olmağa səslədi. Çünki Şeytan insanların açıq-aşkar düşmənidir.

İmam (əleyhissalam) buyurdu: **“Biz Allahın qalib gələn dəstəsiyik. Biz Peyğəmbərin ən yaxın qohumlarıyıq. Biz onun pak Əhli-beytiyik. Babamın ümmət üçün qoyub getdiyi iki əmanətdən biri bizik. Biz Allahın kitabının yanındayıq. Onda hər şeyin izahı var. Batil nə öndən, nə də arxadan ona yol**

---

[33] Əhməd bin Hənbəl, “Müsnəd”, c. 1, səh. 199.

[34] Hakim Nişapuri, “Mustədrək ələs-səhiheyn”, c. 3, səh. 172.

[35] Şeyx Mufid, “əl-İrşad”, c.2, səh. 8,9. “Yənabiul-məvəddə”, c. 2, cəh. 212,213; Əbulfərəc İsfəhani, “Məqatilu ət-Talibin”, səh. 33; İbn Əbilhədid əl-Mötəzili, “Şərhu nəhcul-bəlağə”, c. 16, səh. 30.

**tapa bilməz. Onun təfsiri bizə həvalə olunub. Biz onu yozumuna güman etmərik. Həqiqətlərinə yəqin etmişik. Bizə itaət edin. Şübhəsiz ki, bizim itaətimiz vacibdir. Çünki Allahın və Peyğəmbərinin itaətinə bərabərdir. Allah-təala buyurub: "Ey iman gətirənlər, Allaha itaət edin, Onun peyğəmbərinə və (Peyğəmbərin məsum canişinləri olan) öz əmr sahiblərinizə tabe olun..."**[36]

Həmçinin buyurub: **"... Əgər onu Allahın peyğəmbərinə və özlərinin ixtiyar sahiblərinə həvalə etsəydilər, şübhəsiz onlardan araşdırma əhli olanlar onun həqiqətini dərk edərdilər...**[37] **Şeytanın səsinə qulaq asmaqdan çəkinib ehtiyatlı olun. Çünki o sizin açıq-aşkar düşməninizdir".**[38]

## İMAM HƏSƏNƏ (əleyhissalam) BEYƏT OLUNDUQDAN SONRA MÜAVİYƏNİN YÜRÜTDÜYÜ SİYASƏT

İmam Həsənə (əleyhissalam) beyət olunduqdan sonra o həzrət islam dövlətini idarə etməyə başladı. İslam əyalətlərinə valilər və işçilər təyin etdi. Dövlətin idarə olunmasını tənzimlənməsi üçün plan qurdu və ümmətin siyasi nizamını idarə etməyin əsas lavazimatlarını hazırlamağa başladı.

Əbulfərəc İsfəhani deyir[39]:

**"Sonra (İmam Həsən) minbərdən endi və əmirlərə tapşırıq verdi, işləri nəzərdən keçirdi. Abdullah bin Abbası Bəsrə şəhərinə vali təyin etdi. Həsən bin Əlinin (əleyhissalam) etdiyi ən birinci iş döyüşçülərin məvacibini yüz-yüz artırmaq oldu. Atası Əli (əleyhissalam) Cəməl döyüşü günü belə etmişdi. Həsən (əleyhissalam) isə xəlifə olduqda belə elədi. Ondan sonra gələn xəlifələr bu işdə ona tabe oldular".**[40]

Müaviyə İmam Həsənə (əleyhissalam) beyət olunduğunu bildikdə insanlar arasında fitnə-fəsad yaratmaq üçün içindəki şər və hiylə duyğuları oyanmağa başladı. Məqsədi isə şəri imamın hakim olduğu dövləti və insanların onun

---

[36] Nisa surəsi, ayə 59.
[37] Nisa surəsi, ayə 83.
[38] "Yənabiul-məvəddə", c. 1, səh. 74.
[39] Xətib Bağdadi onun tərcümeyi-halında deyir: *"Əli bin Hüseyn bin Muhəmməd bin Əhməd bin Heysəm bin Mərvan bin Muhəmməd bin Mərvan bin Həkəm bin Əbulas, Əbulfərəc əl-Əməvi. İsfəhani adı ilə tanınmış müəllif. O insanların tərcümeyi-halından və nəslindən xəbərdar, şair biri idi. Ən çox hədis və ədəbiyyata aid məlumatlar nəql etmişdir. Çoxlu kitablar yazmışdır. "əl-Əğani əl-Kəbir", "Məqatilut-talibin" bu kitablardandır. Novbəxti bizə atasından belə nəql edir: "Gördüyümüz hərtərəfli ravilərdən Əbulfərəc Əli bin Hüseyn əl-İsfəhanidir. O, əzbərdən çoxlu şeir, mahnı, tarixi məlumatlar, sənədli hədislər bilirdi". Ələvi deyir: "Əbulhəsən Bətti deyirdi: "Əbulfərəc İsfəhanidən etibarlı, inanılmış başqa heç kim yoxdur. Əbu Nəimin belə dediyini eşitdim: "Əbulfərəc Əli bin Hüseyn əl-İsfəhani hicrətin 357-ci ilində Bağdadda vəfat etdi."* Bax; Xətib əl-Bağdadi, "Tarixu Bağdad", c. 11, səh. 398.
[40] Məqatilut-talibin, səh. 34; Əyanuş-şiə, c. 1, səh. 576.

siyasətinə və hakimiyyətinə olan etirazlarını zəiflətmək idi. Müaviyənin gördüyü ilk iş bu oldu: İslam dövlətinin paytaxtı olan Kufə şəhərinə, həmçinin, siyasi və ictimai ağırlığı olan Bəsrə şəhərinə öz casuslarını göndərdi.

Şeyx Mufid deyir: **"Müaviyə bin Əbu Süfyana Əmirəlmöminin Əlinin (əleyhissalam) vəfatı və insanların İmam Həsənə (əleyhissalam) beyət etməsi xəbəri çatdıqda, Himyər qəbiləsindən olan bir kişini Kufəyə, Bəni-Qeyndən olan bir kişini isə Bəsrəyə casus olaraq göndərdi ki, baş verənlər barədə ona yazsınlar və İmam Həsənin (əleyhissalam) işlərini pozsunlar"**.[41]

Lakin Müaviyənin hiyləgər planı uğursuzluğa uğradı. İmam Həsən (əleyhissalam) bu mənfur planı pozdu.

Şeyx Mufid deyir: **"İmam Həsən (əleyhissalam) bu məsələdən agah oldu. Himyərli casusun Kufədən kənarlaşdırılmasını əmr etdi. Çıxarıldıqdan sonra onun boynunu vurulmasını əmr etdi. Sonra Bəsrəyə məktub yazdı. Qeyndən olan casus da tutulub boynu vuruldu"**.[42]

İmam Həsən (əleyhissalam) Müaviyənin yalan və hiyləyə əl atdığını gördükdən sonra ona sərt məktub yazdı və onun başlatdığı üsyankar cəbhəyə qarşı müharibəyə hazırlaşdığını elan etdi.

## İMAM HƏSƏN (əleyhissalam) VƏ MÜAVİYƏ ARASINDA MƏKTUBLAŞMA

İmam Həsən (əleyhissalam) Müaviyəyə yazdığı məktubda deyirdi:

**"Sən məkr, hiylə və sui-qəsd üçün öz adamlarını, casuslarını mənə göndərdin. Sanki sən hakimiyyətdə qalmaq istəyirsən. Mənim buna heç şübhəm yoxdur. Allahın izni ilə sən də bunu gözlə. Mənə çatıb ki, sən ağıl sahiblərinin etmədiyi bir tərzdə tənə vurmusan. Sən əvvəlkilərin dediyi məsəldəsən:**

**Dünənkinə müxalif olana de ki,**

**O biri üçün hazırlaş, sanki**

**Mən və bizdən vəfat edən**

---

[41] əl-İrşad, c. 2, səh. 9.
[42] əl-İrşad, c. 2, səh. 9.

**Fəda edilmək üçün gecəni sabahlayar.** [43]

Əgər bu məktubda deyilən sözləri diqqətlə nəzərdən keçirsək görərik ki, İmam Həsən (əleyhissalam) Müaviyənin şəxsiyyətini dəqiq surətdə araşdırmışdı. O, hiyləgər və xəyanətkar adam idi. İmam bir göz qırpımı belə şəkk etmirdi ki, Müaviyə müharibə istəyir. Məhz buna görə də tamamilə aşkarcasına **"Mənim buna heç şübhəm yoxdur"** deyir. İmam Həsən (əleyhissalam) **"Allahın izni ilə sən də bunu görəcəksən"** deməklə Müaviyənin və onun əlaltıları qarşısında güc və qüvvət göstərmək, digər cəhətdən də döyüşün taleyini öz əlində tutmaq istəyirdi. Bununla da öz ordusunda və tərəfdarlarında özünəinam yaratmaq istəyirdi. Bu, İslamın izzəti və güclənməsi üçün idi. Buna görə də görürük ki, Müaviyənin cavab məktubu hər hansı təhrikdən uzaq, İmama yaltaqlanmaq və cəsus göndərdiyini inkar etmək kimi ifadələri ehtiva edir. Müaviyə İmama (əleyhissalam) yazdığı məktubda belə deyir:

**"Sənin məktubun mənə çatdı. Dediklərini anladım, baş verənlərdən xəbərdar oldum. Mən sevinməmişəm, tənə vurmamışam, ümidsiz də olmamışam. Əli bin Əbu Talib Əşa bin Qeys bin Söləbənin dediyi kimidir:**

**Sən səxavətlisən, sən sinələrdəki qəlblərdə yer tutmusan**

**Dənizlərin suyu artıb təpələrdən və körpülərdən yuxarı qalxsa da**

**Onun səxavətindən çox deyil, o, minlərlə dirhəmlər və pul kisələri verir**.[44]

Bu üslub Müaviyədən gözlənilən idi. O, imamın hadisələrin məcrasından, Müaviyənin sonradan bəsləyəcəyi düşmənçilik və xəbis niyyətindən xəbərdar olduğunu bilmir ya da özünü blməməzliyə vururdu. Buna görə də İmam Həsən (əleyhissalam) ona ikinci məktub göndərdi. Həmin məktubda müsəlmanlara rəhbərlik etməyin şəri cəhətlərini və özünün bu məqama başqasından daha layiqli olduğunu müfəssəl şəkildə qeyd etmişdi.[45] Həmçinin, həmin məktubda Əhli-beytin

---

[43] "Məqatilut-talibin", səh. 33; İbn Əbilhədid, "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 31.

[44] "Məqatilut-talibin", cəh. 34.

[45] İmamın (ə) məktublarından məlum olur ki, o, dəfələrlə Müaviyəyə imamət və xilafət məsələsində öz haqqını və ona itaət etməyin vacibliyini xatırladır. O bilir ki, nə qədər dəlil və sübutlar təqdim etsə də Müaviyə heç nəyə məhəl qoymayacaq. Məqsəd bəllidir. İmam bu məktubların vasitəsilə ümmətə bildirmək istəyir ki, Peyğəmbərin (s) hədislərində pislədiyi və xilafəti qəsb etməsi barədə əvvəlcədən xəbər verdiyi Müaviyənin xəlifəliyi şəri deyil. Onun yolu doğru yol deyil. Ondan ehtiyatlı olmaq lazımdır. Çünki o, sizi İslamdan uzaq bir yolla aparacaq. Şeyx Həsən bin Fərhan əl-Maliki bu hədislərin bir çoxunu səhih hesab etmişdir. Həmin hədislərdən bəzilərini qeyd edirik:

1) **"Müaviyəni mənim minbərimdə gördüyünüzdə onu öldürün".** Bir neçə səhabə, o cümlədən Əbu Səid əl-Xudri, İbn Məsud bu hədisi nəql etmişdir. Ən azından bu hədis "həsən" hədisdir.

2) Abdullah bin Əmr bin Asın hədisi: **"Bu yerdən bir adam çıxacaq ki, o mənim dinimdə ölməyəcək", bəzi nəqllərdə isə "mənim sünnəm üzərində ölməyəcək". Həmin yerdən isə Müaviyə çıxdı".** Bəlazuri bu hədisi nəql etmiş və onu səhih hesab etmişdir. Hədisin raviləri inanılmış və etibarlı adamlardır. Bu hədisin bəzi hissələrini Ummul-Qura universitetinin doktoru Casim Məşhədani səhih hesab etmişdir.

fəzilətləri və hüquqları barədə yazmışdı. Məktubda Müaviyəyə qarşı təhdid və nəfsinə uyaraq islami birliyi parçalamaqdan çəkindirmək, müsəlmanların qanının tökülməsinin qarşısını almaq kimi ifadələr də yer almışdı.

Əbulfərəc İsfəhani və İbn Əbilhədid həmin məktubu qeyd etmişlər:

**“Rəhman və Rəhim olan Allahın adı ilə. Allahın qulu, möminlərin əmiri Həsəndən Müaviyə bin Əbu Süfyana.**

**Səlamun əleykə. Mən Ondan başqa ilah olmayan Allaha həmd edirəm. Allah-təala Muhəmmədi aləmlərə rəhmət, möminlərə minnət və bütün insanlara peyğəmbər olaraq göndərdi. Qəlbləri diri (və vicdanları haqqı qəbul etməyə hazır) olan kəsləri qorxutsun və (Allahın) sözü (Cəhənnəm vədi) kafirlərin barəsində gerçək olsun! Vəfat edənədək qüsursuz olaraq Allahın hökmlərini çatdırdı və Allahın əmrlərini yerinə yetirdi. Allah onun vasitəsilə haqqı izhar etdi. Onun vasitəsilə şirki aradan apardı, möminlərə zəfər bəxş etdi, ərəbləri izzətli xüsusilə də, Qureyşi şərəfli etdi. Allah-təala buyurub: “Bu sənin və qövmün üçün bir zikrdir”. Elə ki, vəfat etdi, ərəblər onun hakimiyyəti uğrunda mübahisə etdilər. Qureyş: “Biz onun qəbiləsi, ailəsi və dostlarıyıq. Siz insanlar içərisində Muhəmmədin (səllallahu əleyhi və alihi və səlləm) səltənəti və haqqı barəsində mübahisə etməməlisiniz” - dedi. Ərəblər Qureyşin dediyinin doğru, Muhəmmədin (səllallahu əleyhi və alihi və səlləm) səltənətində dəlilin onlara məxsus olduğunu gördülər. Ərəblər onlarla xoş davranıb xilafəti onlara təslim etdilər. Sonra Qureyş ərəblərlə mübahisə etdiyi kimi biz də onlarla danışdıq. Lakin ərəblər Qureyşlə insafla davrandığı kimi Qureyş bizimlə insafla davranmadı. Onlar bu işi (xilafəti) ərəblərdən dəlil və ədalətlə götürdülər. Biz Muhəmmədin Əhli-beyti və sevdikləri olaraq onlara dəlil gətirib onlardan ədalətli davranmağı tələb etdikdə, bizi kənarlaşdırdılar, hamılıqla birləşib bizə zülm və sitəm etdilər. Vəd yeri Allahın hüzurudur. O, hami və yardım edəndir.**

**Bizim haqqımıza qarşı çıxan və Peyğəmbərimizin (səllallahu əleyhi və alihi və səlləm) səltənətinə əl atan bu adamlardan təəccübləndik. Baxmayaraq ki, onlar İslamda ilk olanlardan və fəzilət sahiblərindən idilər. Lakin biz dini qorumaq üçün onlarla mubahisə etmədik. Ehtiyat edirdik ki, münafiqlər və qərəzli insanlar islamda bir çat tapıb ora nüfuz etsinlər və ya törətmək istədikləri fəsad üçün əllərinə fürsət düşsün.**

---

3) Əbu Zərin nəql etdiyi hədis: **“Sünnəmi ilk dəyişəcək şəxs Bəni-Üməyyədən olacaq”**. Bu hədisin sənədi səhihdir. Albani bu hədisi səhih hesab etmişdir. Bax; Həsən bin Fərhan əl-Maliki , “Abdullah bin Sədlə birgə” , səh. 191-193.

**Bu gün, ey Müaviyə, kimsə təəccüb edəcəksə, sənin nə dində bəlli fəzilətin, nə də İslamda tərifəlayiq izin olmadan layiq olmadığın məqama can atmağına təəccüblənməlidir. Sən (İslama qarşı vuruşan) dəstədən olan birinin, Peyğəmbərə (səllallahu əleyhi və alihi və səlləm) ən qatı düşmən olan qureyşlinin övladısan. Lakin Allah səni xar edəcək. Axirət yurdunun kimə məxsus olacağını biləcəksən. Allaha and olsun, ən yaxın vaxtda Rəbbinlə qarşılaşacaqsan. Sonra elədiklərinə görə sənə cəza verəcək. Allah bəndələrinə heç vaxt zülm etməz.**

**Əli (Allah ondan razı olsun) yoluna davam (vəfat) etdikdə müsəlmanlar ondan sonra məni seçdilər. Allah İslamla ona lütf etdiyi və diri olaraq məhşər ayağına gələcəyi gün ona salam olsun! Allahdan axirətdə onun hüzurunda olacaq hörmətimizə xələl gətirən dünyanın keçici hər hansı nemətini bizə bəxş etməməsini istəyirəm. Sənə məktub yazmağımın səbəbi sənin məsələndə Allah-taala ilə öz aramda höccətin tamamlanması üçündür. Əgər tabe olsan sənin üçün böyük lütf, müsəlmanlar üçün isə rahatlıq olar. Batil uğrunda düşmənçilikdən əl çək. İnsanların mənim beyətimə tabe olduqları kimi sən də mənə beyət elə. Sən yaxşı bilirsən ki, Allah yanında, haqqa dönüb onu qoruyan və itaətkar qəlbi olan hər kəsin nəzərində mən bu məqama səndan daha çox layiqəm. Allahdan qorx! Zülmə və itaətsizliyə son qoy və müsəlmanların qanının tökülməsinin qarşısını al! Allaha and olsun ki, onların qanının tökülməsinin qarşısını almaq müqabilində Allahdan alacağın mükafat onların qanı bahasına əldə edəcəyindən daha xeyirlidir. Sülhə və itaətə gəl! Bu məqama səndən daha çox layiq olan və haqqı çatan birilə mübahisə etmə ki, bununla Allah-taala yanar alovu söndürər, vəhdət yaranar və insanlar mehriban olarlar. Əgər sən yenə öz azğınlığında davam etsən, müsəlmanlarla sənin üzərinə gələcəm və Allah bizim aramızda hökm edənədək səni mühakimə edəcəm".**[46]

İmam Həsən (əleyhissalam) bu sözləri ilə xilafətə layiq olmasına dəlil və sübutlar gətirdikdən sonra Müaviyəni sülhə və itaətə, bu məqama ondan daha çox haqqı çatan və layiq olanla mübahisə etməməyə çağırdı.

Müaviyə cavab məktubunda özünü İslamın keşiyini çəkən, qara camaatın qayğısına qalan İslam adından danışan səlahiyyətli bir şəxs kimi təqdim etməyə çalışmışdı.

**"Məktubun mənə çatdı. Məktubunda Allahın rəsulu Muhəmməd (səllallahu əleyhi və alihi və səlləm) barəsində dediklərin fəzilətləri anladım.**

---

[46] "Məqatilut-talibin", səh. 35,36; İbn Əbilhədid, "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 23,24.

**O, qədim, yeni, böyük, kiçik əvvəlkilərin və sonuncuların içərisində bütün fəzilətlərə hamıdan daha layiqdir. O, nəsihət və hidayət etdi. Allah onu həlak olmaqdan xilas etdi, zülmətdə ona nur verdi, onun vasitəsilə cəhalət və zəlalətdən hidayət elədi. Allah ümmətinə görə hər hansı peyğəmbərə verəcəyi mükafatı ən üstün surətdə ona lütf elədi... Onun vəfatını və müsəlmanların ondan sonra xilafət məsələsində mübahisə elədiklərini və atana qalib gəlmələrini qeyd eləmisən. Bununla sən aşkarcasına Əbu Bəkr Siddiqi, Ömər Faruqu, əmanətdar Əbu Übeydəni, Peyğəmbərin həvarlərini, mühacir və ənsarın əməlisalehlərini ittiham etmiş olursan. Bunu sənə yaraşdırmadım. Sən bizim, pis və yaxşı insanların nəzərində belə deyilsən. Mən sənin düz söz və gözəl xatirələr danışmağını istəyirəm. Bu ümmət öz arasında mübahisə etdikdə sizin fəzilətinizi, ilk müsəlman olmanızı, Peyğəmbərə olan yaxınlığınızı, İslam və müsəlmanların nəzərindəki yerinizi inkar etməmişdir. Ümmət Peyğəmbərə olan yaxınlığına görə bu məqamın Qureyşə verilməsinə qərar vermişdir. Qureyşin əməlisalehləri, ənsar və ümumu insanlar Qureyşdən islamı ilk qəbul edən, Allahı tanıyan, Allahın əmirlərini yerinə yetirməkdə ən istəkli və güclüsünün hakimiyyətə gəlməsini istədilər. Buna görə də Əbu Bəkri seçdilər. Bu din və fəzilət sahiblərinin, ümmətin məsuliyyətini daşıyanların rəyi idi. Bu sizin qəlblərinizdə onlara qarşı ittiham duyğusu yaratdı. Lakin onlar ittiham olunmamalı idilər və etdikləri işdə xəta etməmişdilər. Əgər müsəlmanlar sizlərdən birinin ondan üstün olduğunu, onun yerində ola biləcəyini və İslamın hüdudlarını qoruyacaq birinin olduğunu görsəydilər, bu işi ondan uzaqlaşdırıb başqasına üz tutmazdılar. Allah onlara İslam və müsəlmanlara görə xeyirli mükafat versin.**

**Məni sülhə dəvət etdiyini bildim. Səninlə mənim aramdakı vəziyyət eynilə Peyğəmbərin vəfatından sonra sizinlə Əbu Bəkr arasında olan vəziyyət kimidir. Əgər sənin insanları məndən daha yaxşı idarə edəcəyini, ümmətlə ehtiyatla davranacağını, daha yaxşı siyasət yürüdəcəyini, daha yaxşı mal toplayacağını və düşmənlərə qarşı daha tədbirli olacağını bilsəydim dəvət etdiyini qəbul edərdim. Sənin xilafətə layiq olduğunu görsəydim, atandan sonra bu məsələni (xəlifəliyi) sənə təslim edərdim. Atan Osmana qarşı çıxdı, ta ki, Osman məzlum olaraq qətlə yetirildi. Allah onun qanının qisasını tələb etdi. Allahın tələb etdiyi onun əmrindən yayına bilməz. Sonra ümmətin rəhbərliyini ələ keçirdi. Cammat müxalif oldu. İslamda ilk olanlar və cihad edənlərin öndərləri müxalif oldu. (Atan) onların beyəti pozmalarını iddia edərək onlarla vuruşdu, qanlarını tökdü. İrz və namus əldən getdi. Sonra bizə üz tutdu. Bizə qarşı beyət iddiası yox idi. Lakin bizə hakim olmaq istəyirdi. Biz onunla vuruşduq, o da bizimlə vuruşdu. Sonra döyüş onun və bizim bir**

**nümayəndə seçməyimizə qədər davam elədi. (Nümayəndə seçdik ki,) bu məsələdə doğru və düzgün olana hökm versinlər. Camatın arasında birlik və mehribançılıq olsun. O iki nəfərdən bu barədə əhd-peyman aldıq. Ondan (atanandan) da veriləcək hökmə razı olmaq barədə əhd-peyman aldıq. Sən bildiyin kimi, iki hakim onun əleyhinə hökm verib onu xəlifəlikdən çıxardılar. Allaha and olsun ki, o, hökmə razı olmadı. Sən xəlifəlikdən xaric olan atanın haqqı olaraq əldə etdiyin bu işə (sənin xəlifəliyinə tabe olmağa) məni necə dəvət edirsən? Özünə və dininə bax... Bilirsən ki, mən səndan daha çox zaman hakimiyyətdə olmuşam və səndən əvvəl bu ümmətlə təcrübəm var. Yaşda səndən böyüyəm. Sən məni dəvət etdiyin dərəcəyə enib məni qəbul etməyə daha layiqsən. Sən mənim itaətimə tabe ol... Allah səni də, bizi də Onun itaətində olmağa yardım eləsin. Həqiqətən də o, (hər şeyi) eşidən və duanı qəbul edəndir”.**[47]

Əgər Müaviyənin sözlərinə insaf nəzərləri ilə diqqət yetirsək, onun boş, haqdan uzaq olduğunu görərik. Buna sübut üçün onun *“Ümmət cəm olaraq Əbu Bəkri seçmişdir”* sözləri dəlildir. Əgər belədirsə, ümmət İmam Əlini (əleyhissalam) də seçməmişdirmi? Bəs nə üçün ona qarşı qılınc çəkib itaətsizlik elədi? Nə üçün islam dövlətinə qarşı müharibə elan elədi? Nəticədə Əmmar bin Yasir kimi Peyğəmbərin (c) səhabələri qətlə yetirildi. Halbuki Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) Əmmar haqqında buyurmuşdu: **“Ey Əmmar, səni yolunu azmış dəstə qətlə yetirəcək”**.[48]

Nə üçün Müaviyə İmam Həsəndən (əleyhissalam) beyət tələb edir? Halbuki ümmət ona beyət etmiş və idarəçilik səlahiyyətini ona həvalə etmişdir. Əgər Şam İmam Həsənə (əleyhissalam) beyət etməmişdirsə, onsuzda onlar ikinci xəlifə Ömər bin Xəttabın dövründə Müaviyə ora vali təyin olunduğu vaxtdan etibarən heç vaxt əvvəlki xəlifələrin hakimiyyətinə tabe olmamış və beyət etməmişdir.

Müaviyə hansı hakimiyyətlə təşəbbüs göstərir? Onun hakimiyyəti və təcrübəsi ən pis hakimiyyət və təcrübə idi. O, yalnız siyasi hakimiyyət, cahiliyyət dönəminin qisasını, şəxsi mənfəət və qəbilə hakimiyyəti məqsədini güdürdü.[49]

Doktor Əhməd Rifai “Əcrul-Məmun” kitabında deyir:

**Bu məktub bəzi cəfəngiyyatları ehtiva edir. Məktubda deyilir: “Bu ümmət öz arasında mübahisə etdikdə sizin fəzilətinizi, ilk müsəlman olmanızı, Peyğəmbərə olan yaxınlığınızı, İslam və müsəlmanların nəzərindəki yerinizi inkar etməmişdir...” Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm)**

[47] “Məqatilut-talibin”, səh. 36-37; İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 36.
[48] “Səhih Müslim”, c. 8, səh. 186; “Sünəni Tirmizi”, c.5, səh. 333.
[49] Əhməd Fuad, “əı-İmam Həsən əl-Qaid vət-tarix”, cəh. 51.

**vəfatından sonra baş verən hadisələri izləyən şəxsə məlumdur ki, Peyğəmbərin vəfatından sonra pak Əhli-beyt çox ağır məşəqqətlər çəkmiş və bəlalara məruz qalmışlar. Yaranın qanı hələ də axmaqdadır. Peyğəmbər hələ qəbrə qoyulmamış onun əmrini dəyişdilər. səqifədə cəm olaraq Peyğəmbərlərinin əhli-beytini unutdular. Bütün bunların nəticəsi Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) vəfatından 50 il keçdikdən sonra bir ölkədən digər ölkəyə gedən mənfur dəstənin onun övladlarının başlarını nizələrin ucunda daşımasında üzə çıxdı".**[50]

## İMAM HƏSƏNİN (əleyhissalam) MÜAVİYƏYƏ GÖNDƏRDİYİ SON MƏKTUB

İmam Həsən (əleyhissalam) Müaviyənin onun hakimiyyətinə tabe olmamaqda israrlı olduğunu, ümməti İslam ruhuna yad olan işlərlə aldadacağını bildi. Çünki o, özünü xilafət mənsəbinə şəri namizəd kimi təqdim edəcəkdi. İmam bilirdi ki, gec və ya tez Müaviyə ona qarşı müharibə edəcəkdir. Buna görə İmam müharibədən başqa bir çıxış yolunun olmadığını, haqla batilin ayrılıq nöqtəsi olacaq həmin günə hazırlaşmağın labüd olduğunu görürdü. Bu səbəbdən İmamın cavab məktubu çox gecikmədi:

**"Sənin yazdığın məktub mənə çatdı. Orada yazdığını yazmısan. Sənə haqsızlıq etməkdən ehtiyat edərək cavab verməyi tərk etdim. Allaha pənah aparıram bu işdən. Haqqa tabe ol. Onda mənim həqiqətən haqlı olduğumu biləcəksən. Vəssəlam".**[51]

Bununla da İmam (əleyhissalam) Müaviyə ilə arasında faydası olmayacaq bu dialoqa son qoydu. Burada gözəl tərzdə danışıqlar aparmaq üslubunun faydası yoxdur. Xüsusilə də, qarşı tərəf bu üsluba inanmırsa. Məhz buna görə də İmam (əleyhissalam) Müaviyənin başa düşəcəyi dilə - hərb dilinə keçdi.

## MÜAVİYƏ İNSANLARI İMAM HƏSƏNƏ (əleyhissalam) QARŞI VURUŞMAĞA HAZIRLAYIR

İmam Həsənin (əleyhissalam) məktubu Müaviyəyə çatdıqda əyalətlərdə olan təbəələrinə vahid məzmunda məktub yazdı:

---

[50] Tofiq Əbulələm, "Həsən bin Əli", səh. 137,138.
[51] "Məqatilut-talibin", səh. 38; "Əyanuş-şiə", c.1, səh. 568.

**Allaha həmd olsun ki, düşmənlərinizin və xəlifənizin qatillərinin əziyyətindən sizi qorumuşdur. Allahın lütf və gözəl əməllərindəndir ki, öz qullarından birini göndərdi və onun canına qıyıb qətlə yetirdi. Bununla da onun tərəfdarlarını parçaladı. Onların əyanları və böyükləri məktub yazıb özləri və əşirətləri üçün əman xahiş edirlər. Mənim məktubum sizə çatan kimi ciddi hazırlıqla yanıma gəlin. Allaha həmd olsun ki, siz intiqam alacaq və arzunuza çatacaqsınız. Allah zalım və təcavüzkarları həlak edəcək. Vəssəlam.”**

Ordu Müaviyənin ətrafında toplaşdı və o, İraqa tərəf üz tutdu.[52]

Bu məktubda nəzər diqqəti çəkən budur ki, Müaviyə təcavüz və zülmü İmam Əliyə (əleyhissalam) nisbət verir. Halbuki təcavüzkarlar Müaviyə və onun ordusu idi. Onlar hörmətli səhabə Əmmar bin Yasiri qətlə yetirdilər. Yuxarıda Müslimin Əmmarı yolunu azmış dəstə qətlə yetirəcəyi barədə nəql etdiyi rəvayəti qeyd etmişdik.

İmam Həsənin (əleyhissalam) Müaviyə ilə məktublaşmalarından gözlədiyi məhz elə bu idi. Buna görə də İmam onunla məktublaşmağı kəsdi və umumi qoşun yığmağa və xalqı ayağa qaldırmağa başladı. Müaviyənin və Şam ordusunun qarşısını almaq üçün bütün qüvvələri səfərbər etdi.

## HƏRB QAÇILMAZDIR

İmam Həsən (əleyhissalam) müharibəyə başlamaq məqsədilə ordunu hazırlamaq üçün Hücr bin Udəyi tərəfdarlarının yanına göndərdi. Sonra carçı hamının camaat namazında toplaşmasını car çəkdi. Hər tərəfdən insanlar cəm olmağa başladılar. İmam Həsən (əleyhissalam) camaat toplaşdıqdan sonra ona xəbər verilməsini dedi. Səid bin Qeys əl-Həmdani gəlib İmama xəbər verdi. İmam Həsən (əleyhissalam) minbərə çıxıb Allah-təalaya həmd və səna etdikdən sonra buyurdu:

**Allah cihadı yaratdıqlarına (insanlara) vacib buyurub onu xoşagəlməyən adlandırdı. Sonra cihad edən möminlərə “Səbr etin! Allah səbr edənlərlədir” buyurdu. Ey insanlar, yalnız səbr etməklə xoşlamadıqlarınızdan xilas olub istədiklərinizə nail ola bilərsiniz. Mənə xəbər çatıb ki, Müaviyə onun üzərinə gələcəyimizdən xəbərdar olduğu üçün yürüşə çıxıb. Allah sizə**

---

52 “Əyanuş-şiə”, c.1, səh. 568; “Məqatilut-talibin”, səh. 38; “əl-Ğədir”, c. 1, səh. 291.

**rəhm eləsin! Siz də Nuxeylədəki ordugahınıza tərəf hərəkət edin. Orada gözləyin, biz də gözləyirik. Nə olacağını siz də, biz də görəcəyik”.**[53]

## KUFƏ CƏMİYYƏTİNİN MÜXTƏLİFLİYİ

İmam Həsənin (əleyhissalam) ordusunun əsasını təşkil edən Kufə camaatı müxtəlif yönümlü, qarışıq düşüncəli insanlardan ibarət idi. Bu isə hadisələrin axarına mənfi təsir göstərirdi. Bu müxtəlif yönümləri bir neçə qismə bölə bilərik:

**1. Xəvaric**

Onlar İmam Əlinin (əleyhissalam) itaətinə qarşı çıxıb onunla vuruşanlar və ona düşmənçilik bəsləyənlərdir. Onlar İmam Həsənlə (əleyhissalam) Müaviyəyə qarşı vuruşmağı ortaq yol hesab edirdilər. Bu qrup ən kiçik şübhə qarşısında özünü itirərək tələsik hökm çıxarırdı.

**2. Əməvi hakimiyyətini istəyənlər. Onlar iki qismdən ibarət idilər.**

a) Kufədəki mövcud hökumətdə istəklərinin, şəxsi mənafelərinin, tamahlarının təmin olunmamasını görüb içlərində Şama sədaqət gizlədənlər. Onlar hakimiyyətə qarşı çıxıb onu Müaviyəyə təslim etmək üçün fürsət güdürdülər.

b) Keçmişdə baş vermiş hadisələr və şəxsi mövqelərinə görə Kufə hökumətinə kin-küdurət bəsləyənlər.

**3. Tərəddüddə olan qrup.**

Bu qrupun müəyyən bir məsləki və ya istiqaməti yoxdur. Onların yeganə arzuları sağ qalmaq və qalib gələcək tərəfdə öz mənfəətlərini güdmək idi. Onlar yaxından izləyirdilər ki, güc tərəzisinin hansı gözü ağır gələrsə, ona tərəf də meyl etsinlər.

**4. Kor-koranə düşüncəyə sahib olan dəsdə**

Bu dəsdənin hər hansı bir əsasa istinad edən heç bir prinsipi yoxdur. Onlar hər səsin ardınca gedir və hər küləyə meyl edirdilər. İmam Əli (əleyhissalam) bu kor-koranə düşüncə sahibləri haqqında buyurur: **“Onlar bir yerə cəm olsalar qalib gələrlər, parçalandıqda isə tanınmazlar”.**[54]

**5. İxlaslı mömin dəstə.**

[53] “Məqatilut-talibin”, səh. 39; İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 38.
[54] “Nəhcül-bəlağə”, səh. 504.

Bu dəstə sayca ən az olan xeyirli insanlardır. Onların səsi digər dəstələrin səsinin içində itib batır.[55] Kufənin vəziyyəti belə idi. Buna görə də İmam Həsən (əleyhissalam) onlara xitab edəndə susdular və onlardan heç kim danışmadı. Udəy bin Hatəm bunu gördükdə ayağa qalxıb dedi: **“Mən Hatəmin oğluyam. Bu necə də pis məqamdır. İmamınıza və Peyğəmbərinizin qızının oğluna cavab verməyəcəksinizmi? Hanı Muzirin xətibləri?! Rifahda dilləri iti qılınc kimidir. Vəziyyət ciddi olduqda isə hiyləgər tülkü olursunuz. Allahın nifrətindən, eyb tutacağından və ar edəcəyindən qorxmursunuzmu?”.**[56]

## ORDUNUN UĞURSUZLUĞU VƏ İMAM HƏSƏNİ (əleyhissalam) TƏRK ETMƏLƏRİ

Qeyd olunanlardan əlavə ordunun İmam Həsəni (əleyhissalam) köməksiz qoymaları hərbi və psixoloji baxımdan məğlubiyyətə gətirib çıxardı. İbn Əsir ordunun İmam Həsəni (əleyhissalam) tək və yalnız qoyması barədə deyir:

**“Həsən Mədainə gəldikdə carçı qoşunun içində car çəkərək dedi: “Qeys bin Səd qətlə yetirilmişdir. Çıxın gedin”. İmam Həsənin xeyməsini (çadırını) qarət edib getdilər. Hətta üzərində oturduğu xalçanı belə altından çəkib apardılar. İmam onlara daha çox nifrət etdi və onlardan daha çox ehtiyat etməyə başladı... İmam Həsən qoşunun param-parça olduğunu gördükdə Müaviyəyə məktub yazdı...”** [57]

## MÜAVİYƏNİN İNSANLARI PUL İLƏ SATIN ALMASI

Müaviyə ordu başçılarını pul ilə satın alırdı. Onlardan biri də Übeydullah bin Abbas idi. Müaviyə onu təhdid etdi və İmam Həsənin (əleyhissalam) ordusunu tərk edərək onun yanına gəldikdə ona mal-dövlət verəcəyini vəd edərək şirnikləndirdi. İsfəhani və İbn Əbilhədid deyirlər: **“Müaviyə Übeydullah bin Abbasa yazaraq belə deyirdi: “Həsən mənə yazıb sülh istəyir və xəlifəliyi mənə verəcəkdir. Əgər sən indi mənim itaətimə daxil olsan tabe olunanlardan (başçı) olacaqsan. Əks təqdirdə isə sən tabe olaraq mənim itaətimə daxil olacaqsan. Əgər sən indi mənim yanıma gəlsən, sənə min dəfə min (milyon) dirhəm verəcəm.**

---

[55] Şeyx Mufid deyir: *“İnsanlar cihad etmək istəmirdilər. (Səfərbərlik) əmrini yerinə yetirməkdə ləngiyirdilər. Sonra qarışıq insanlar cəm oldular. Bəziləri İmamın (ə) və atasının (ə) şiələri, bəziləri hər nə vəchlə olsun Müaviyəni qətlə yetirmək istəyən “təhkim” camaatı, bəziləri fitnə və qənimət güdənlər, bəziləri şübhədə olanlar, bəziləri isə dinə bağlılıqları olmayan və qəbilələrinin başçılarına tabe olan təəssübkeş insanlar idi.”* (Bax; Cavad Fəzlullah, “Sülhu əl-İmam əl-Həsən”, səh. 84-85.)

[56] “Məqatilut-talibin”, səh. 39; “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 39; “Əyanuş-şiə”, c. 1, səh. 568.

[57] İbn Əsir, “əl-Kamil fit-tarix”, c. 3, səh. 404, 405; “Əyanuş-şiə”, c. 1, səh. 569; “ən-Nəsaihul-kafiyə”, cəh. 192.

**Əvvəlcədən yarısını, digər yarısını isə Kufəyə daxil olaramsa, verəcəm. Übeydullah gecə ikən gizlincə Müaviyənin ordusuna qoşuldu. Müaviyə ona vəd verdiyini etdi..."**[58]

Həmçinin, Seyid Muhsin Əmin "Əyanuş-şiə" kitabında deyir:

**"İmam Həsən (əleyhissalam) Müaviyənin üzərinə Kində qəbiləsindən olan bir nəfərin başçılığı ilə 4000 min nəfərdən ibarət qoşun göndərdi. Qoşun Ənbara çatdıqda Müaviyə ona 500000 dirhəm pul göndərdi. Ona Şamın və Hicazın bəzi əyalətlərinin valiliyini vəd etdi. O da 200 nəfər olan ən yaxın adamları ilə Müaviyəyə tərəf keçdi. Sonra Murad qəbiləsindən bir nəfər göndərdi. O, birinci kimi etməyəcəyinə dağların davam gətirməyəcəyi andlar içdikdən sonra yenə əvvəlki kimi elədi. Onun əvvəlki kimi xəyanət edəcəyini İmam Həsən (əleyhissalam) xəbər vermişdi"**.[59]

Ordu yavaş-yavaş İmamı tərk edirdi. Hətta iş o yerə çatdı ki, İmamın ordusundan olan biri onu şirkdə ittiham edərək xəncərlə onu yaraladı. Bəni-Əsəd qəbiləsinin Bəni-Nəsr bin Qeyn tayfasından Cərah bin Sinan adlı biri İmama yaxınlaşdı. Səbat yolunun qaranlığından keçərkən İmamın miniyinin cilovundan tutaraq, digər əlində isə oraq belə dedi: **"Allahu əkbər, ey Həsən, sən də şirk elədin. Necə ki, atan əvvəlcədən şirk eləmişdi". Sonra İmama xəsarət yetirdi. İmam budundan yaralandı. Yara o qədər dərin idi ki, budu sümüyünə qədər açılmışdı. İmam Həsən (əleyhissalam) əlindəki qılıncla onu vurduqdan sonra hər ikisi yerə yıxıldı"**.[60]

## MÜAVİYƏNİN QƏBİLƏ BAŞÇILARINI ƏLƏ ALMASI

Bəzi qəbilə başçıları Müaviyəyə itaət edəcəkləri və (Müaviyənin) gəldiyi təqdirdə İmam Həsəni (əleyhissalam) ona təslim edəcəklərinə zamin olmaları barədə məktub yazırdılar. Şeyx Mufid deyir: **"Bəzi qəbilə başçıları gizlincə Müaviyəyə məktub yazıb onu yürüş etməyə təşviq etdilər. Həmçinin Müaviyənin ordusu yaxınlaşdıqda İmam Həsəni (əleyhissalam) ona təslim edəcəkləri və ya öldürəcəklərini öhdələrinə götürdülər. Bu xəbər İmam Həsənə (əleyhissalam) çatdı"**.[61]

---

[58] "Məqatilut-talibin", səh. 42.
[59] "Əyanuş-şiə", c. 1, səh. 569.
[60] "Məqatilut-talibin", səh. 41; "əl-İrşad", c.2, səh. 12.
[61] "əl-İrşad", c. 2, səh. 12.

Bu ona dəlalət edir ki, Müaviyə mal, yalan, şaiyə və bu kimi müxtəlif üslub və yollarla İmam Həsənin (əleyhissalam) ordusunun əsasını laxlatmış, ordu və qəbilə başçılarını ələ almışdı.

Müaviyə ümmətin İmam Həsənin (əleyhissalam) təmsil elədiyi din xəttinə, elmi, əməli və tətbiq baxımından peyğəmbərliyin davamı olmasına iman gətirmədiyini gördükdə, öz məqsədlərinin həyata keçməsi üçün münbit şəraitin olduğunu görürdü. Deməli, Müaviyə İmamın bəzi ordu başçılarını ələ almaqla planlaşdırdığı məqsədlərində uğur qazandı. Buna görə də İmam Həsən (əleyhissalam) bu qeyri-bərabərsizliyin diktə etdiyi reallığa görə təslim olmaqdan başqa çıxış yolunun olmadığını bildi.

Lakin İmam bu bərabərsizliyin Müaviyənin istəklərinə uyğun inkişaf etməsinə imkan vermədi. Buna görə də İmam sülh məsələsini qəbul etməklə ən xeyirli iş görərək Müaviyənin Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) xəlifəliyi mənsəbinə çatmaq üçün yürütdüyü siyasətin iç üzünü açdı. Bu barədə gələcək fəsillərdə danışacağıq. Lakin əvvəlcə yuxarıda qeyd etdiyimiz Müaviyənin öz dövlətini qurmaq uğrunda hiylə, xəyanət, zülm, tamah, şəxsi mənafe üzərində köklənmiş siyasəti müqabilində İmamın (əleyhissalam) yürütdüyü siyasəti izah edək.

## İMAM HƏSƏNİN (əleyhissalam) SİYASƏTİ

Müaviyənin iyrənc siyasəti müqabilində Əli evinin siyasəti yalan və hiylədən uzaq olaraq ağıl, ədalət və insaf əsasında idi. Bu siyasətin əsasını İmam Əli (əleyhissalam) qoymuşdur. Əgər biz onun xəyanətkar və hiyləgər rəqibinə qarşı yürütdüyü siyasətin bir nümunəsinə baxsaq, dediklərimiz tam mənası ilə aydın olacaq. İmam Əli (əleyhissalam) bu mənfi xüsusiyyəti tənqid edərək xütbələrinin birində buyurur:

**“Ey insanlar, məbadə kimisə aldadasınız. Bu, alçaq adamların xüsusiyyətlərindəndir. Əməli saflaşdırmaq əməlin özündən çətindir. Niyyəti fəsaddan qorumaq əməl edənlər üçün cihad etməkdən də çətindir. Heyhat! Əgər təqva olmasaydı ərəbin ən dahisi olardım”.**[62]

Həmçinin buyurub: **“Allaha and olsun ki, Müaviyə məndən dahi deyil. Lakin o, hiyləgərlik edir, aldadır və günah edir. Əgər hiylənin bəyənilməməsi olmasaydı, mən insanların ən dahisi olardım. Lakin hər bir hiylə aşkar günahdır. Hər bir aşkar günah küfrə bərabərdir. Hər bir hiyləgərin qiyamət**

---

[62] Corc Cordaq, “Rəvaiu nəhcil-bəlağə”, səh. 90.

**günü tanınacağı pərçəmi (bayrağı) olacaq. Allah heç bir hiylədən qəflətdə olmaz və heç bir pisliyə göz yummaz".**[63]

Həmçinin, islam hakiminə hər hansı növ yaltaqlıq və yaxınlığı rədd etməsinə ən yaxşı dəlil Əmirəlmömininin (əleyhissalam) sadə bir hədiyyə verməsi müqabilində Əşəs bin Qeysi danlamasıdır. Bəlkə də bu müasir dövrümüzdə bir o qədər əhəmiyyət daşımır. Lakin İmam bunu çox böyük əhəmiyyətli hesab edirdi. İmamın həmin adama cavabı məna dolu sözlərlə oldu.

"Bundan da təəccüblüsü əlində boxçası qapımızı döyən şəxsdir. Sanki ilanın ağız suyu və ya zəhəri ilə yoğrulmuşdu. Ona dedim: **"Bu qohum payı ya zəkat ya da sədəqədir? Bu, biz Əhli-beytə haramdır". O isə dedi: "Nə odur, nə də bu. Lakin bir hədiyədir". Ona dedim: "Övladlarını itirmiş analar yasına otursun! Allahın dini ilə məni aldatmağa gəlmisən? Sən ağlını itirmisən, yoxsa məcnunsan?! Çıx get burdan! Allaha and olsun ki, yeddi iqlimi və bütün fələkləri mənə versələr ki, çəyirtkənin ağzında çeynədiyi yemi onun ağzından almaqla ona zülm edim, yenə etmərəm. Əlinin fənaya uğrayacaq nemət və keçici ləzzətlə bir əlaqəsi olmaz. Ağılın yatmasından və xətanın pisliyindən Allaha sığınır və ondan yardım istəyirik".**[64]

İmam Həsən (əleyhissalam) atasının təyin etdiyi hakimin ümmətlə davranış qaydalarına əməl edirdi. Baş verən istər böyük, istərsə də kiçik hadisələrdə atasının təyin etdiyi islam qayda-qanunlarına müxalif olan heç bir vasitədən istifadə etmirdi. Buna görə də sülh bağlandıqdan sonra tərəfdarlarına xitab edərkən onlara bu qayda-qanunları xatırlatdı. Yəni, əgər o da dünya üçün yaşasaydı, Müaviyə ondan daha çox tədbirli ola bilməzdi. Lakin İmam hikmət və ilahi dəyərlərə əsasən hərəkət edirdi.

İmam Həsən (əleyhissalam) belə buyurdu: **"Siz bizim şiələrimiz və bizi sevənlərsiniz. Biz sizi bizə səmimi yoldaş və bizə qarşı doğru olan şəxslər kimi tanıyırıq. Dediklərinizi bildim. Əgər dünya istəsəydim, dünya üçün çalışar və mənfəət əldə edərdim. Müaviyə məndən güclü və sərt deyil. Ona görə də mənim rəyim sizin rəyinizdən fərqli oldu. Lakin mən Allahı və sizi şahid tuturam ki, mən bununla sizin qanınızın tökülməməsini və münasibətlərinizin islah olunmasını istədim..."** [65]

Beləcə İmam böyüyüb tərbiyə aldığı dəyərlər və islam əxlaqı ilə hərəkət etdi. Əgər dünya üçün yaşasaydı, hakimiyyət və səltənət arzusunda olsaydı, Müaviyənin pul ilə satın almaq, qorxutmaq, şirnikləndirmək kimi üslublarından istifadə edərdi.

---

[63] "Şərhu nəhcil-bəlağə", c. 10, cəh. 211.
[64] "Nəhcul-bəlağə", c.2, səh. 218. Muhəmməd Əbduhun tədqiqi ilə.
[65] İbn Quteybə, "əl-İmamə vəs-siyasə", c. 1, səh. 141.

Həmin vaxt o, bütün islam coğrafiyasının hakimi idi. Əgər belə etsəydi, bütün hadisələr onun xeyrinə bitərdi və Müaviyənin hadisələri yönəltmək üçün işlətdiyi hiylələr heç bir nəticə də verməzdi.

## İKİNCİ FƏSİL

## İMAM HƏSƏNİN (əleyhissalam) SÜLHÜ

### MÜQƏDDİMƏ

Sülhün məzmununu qeyd etməzdən əvvəl son dərəcə əhəmiyyətli olan bir məsələyə toxunmaq istəyirik. Sülh təklifi Müaviyə tərəfindən gəlmişdi. İmam Həsən (əleyhissalam) Mədaində dediyi xütbədə buna işarə edərək buyurmuşdu: **"Müaviyə bizi elə bir işə dəvət edir ki, onda nə izzət var, nə də ədalət. Əgər ölümü seçsəniz, bu təklifi geri qaytarar və qılıncımızın ucu ilə onu Allahın mühakiməsinə verərik. Əgər həyatı seçsəniz qəbul edib sizin razılığınızı əsas götürərik".**[66]

İmamın (əleyhissalam) qarşısında qeyd etdiyimiz şəraitin tələbinə uyğun olaraq sülhlə razılaşmaq və Müaviyənin təklifini qəbul etməkdən başqa çıxış yolu yox idi. Lakin İmam sülhün şərtlərinin pozulacağı üçün qəbul etdi. Çünki Müaviyə kimi biri ən yaxın zamanda şərtbəşərt razılaşmanı pozmaya bilməzdi. Sonra isə insanlar ona nifrət edəcək və ona qəzəblənəcəklər. Sülh nəsillər boyu ona qarşı nifrət toxumuna çevriləcək. Tarix boyu qəsb olunmuş hakimiyyətin yer üzündən silinməsi üçün baş verəcək qiyamların toxumu olacaq.[67] İmam (əleyhissalam) bu şərtləri seçdi ki, Müaviyəni sınağa çəkərək, sonra onu sorğu sual edərək və həqiqətini üzə çıxarmaqla biabır edərək tarix qarşısında qoysun.

### SÜLH MÜQAVİLƏSİ TARİXÇİLƏRİN DİLİNDƏ

Tarixçilərin və hədis alimlərinin sülhün mətni barədə qeyd etdikləri məlumatlar yarımçıq və müxtəlif qaynaqlarda yayılmış formadadır. Buna görə də həmin mətnlərin bəzilərini qeyd edib bir-birilə əlaqələndirəcəyik ki, oxucu ziddiyyətli və parça-parça yazılmış bu tarixi hadisə barədə tam məlumat əldə edə bilsin. İbn Əsəm əl-Kufi, İbn Təlhə Şafei, İbn Səbbağ Maliki bu hədisənin müəyyən hissələrini nəql etmişlər. Onların qeyd etdikləri mətnlər demək olar ki bir-birinə yaxındır. Həmçinin, Süyuti, İbn Quteybə, İbn Həcər, İbn Ənbə, İbn Əsir, Əbulfida və başqaları sülhün mətnini qeyd etmişlər.

#### 1. İbn Əsəm, İbn Təlhə və İbn Səbbağın nəql etdiyi mətn

[66] İbn Əsakir, "Tarixu mədinəti Diməşq", c. 13, səh. 268; İbn Əsir, "Usdul-ğabə", c. 2, səh. 13; "Siyəru əlamun-nübəla", c. 3, səh. 269.
[67] Tofiq Əbu Ələm, "Həsən bin Əli", səh. 208.

Sonuncu belə nəql edir: **“Bağışlayan və mehriban Allahın adı ilə. Bu Həsən bin Əli bin Əbu Talibin Müaviyə bin Əbu Süfyanla bağladığı sülhdür. Onunla (Müaviyə ilə) Allahın kitabı və Peyğəmbərin sünnəsinə uyğun tərzdə insanlarla davranması şərtilə müsəlmanların hakimiyyətini ona təhvil verməsi barədə sülh bağlanılır. Müaviyə özündən sonra heç kimi vəliəhd təyin edə bilməz. İnsanlar Şam, Hicaz, Yəmən və Allahın istənilən torpağında yaşamalarına baxmayaraq əmin-amanlıqda olmalıdırlar. Əli tərəfdarları harda olsalar canları, ailələri, övladları, malları toxunulmaz olmalıdır. Bu barədə Müaviyədən Allahın adı ilə əhdi-peyman alınır. Müaviyə Həsən bin Əli, qardaşı Hüseyn bin Əli və Peyğəmbər Əhli-beytindən olan hər hansı bir kəsə aşkarcasına və ya gizli şəkildə zülm etməməlidir. Həmçinin, yer üzünün hər hansı bir yerində olursa-olsun heç kəsə qorxu yaşatmağa haqqı yoxdur. Bu şərtlərə filan və filan şahid oldular. Allahın şahidliyi yetərlidir”.**[68]

**2. Süyuti və İbn Həcər belə nəql edirlər.**

(Mətn birinciyə aiddir) **“Həsən – Allah ondan razı olsun – atasının qətlindən sonra Kufə əhalisinin beyət etməsi ilə xəlifə seçildi. Altı ay və bir neçə gün xəlifə oldu. Sonra Müaviyə ona qarşı yürüş etdi. Bu iş Allaha məxsusdur. Həsən məktub yazaraq xəlifəliyi ona təhvil vermək istədiyini bildirdi. Bu şərtlə ki, ondan sonra xəlifəlik yenidən onun olsun. (İmam Həsənin) atasının vaxtında Mədinə, Hicaz və İraq əhalisinə verilən hər hansı bir şeyi tələb etməsin və onun borclarını ödəsin. Müaviyə onun tələblərini qəbul etdi. Sonra onlar bu şərtlərə görə sülh bağladılar”.**[69]

Süyuti sülhün bəndlərində İmam Həsənin Müaviyədən sonra xilafətin ona verilməsini şərt kəsdiyini qeyd edir. İbn Həcər “Fəthul-bari” kitabında bu şərti güclü sənədlə dəstəkləyir. O, belə deyir: “Muhəmməd bin Qudamə “Kitab əl-Xəvaric”də Əbu Bəsrədən etibarlı sənədlə nəql edir ki, o, Həsən bin Əlinin Müaviyənin yanında xütbə edərkən belə dediyini eşitmişdir: **“Mən Müaviyə ilə ondan sonra xilafətin mənə aid olmasını şərt kəsmişəm”.**[70]

Həmçinin İbn Həcər deyir: **“Yəqub bin Sufyan Zühriyə istinadən etibarlı sənədlə nəql edərək deyir: “Həsən bin Əli Müaviyədən sonra xilafətin ona məxsus olması barədə şərt yazaraq səhifə göndərdi. Həmin səhifə Müaviyəyə çatdı. Müaviyə ona sülh istədiyi barədə məktub yazmışdı və qasid ilə sonunda möhür olan boş bir səhifə göndərmişdi. Ona demişdi: “Nə şərt istəyirsən yaz. Bu, sənin ixtiyarındadır”. Həsən əvvəl istədiyindən qat-qat artıq şərtlər**

---

[68] İbn Əsəm əl-Kufi, “əl-Futuh”, c. 4, səh. 291; İbn Təlhə Şafei, “Mətalubus-suul”, səh. 357; İbn Səbbağ, “əl-Fusul əl-Muhimmə”, c. 2, səh. 728, 729.

[69] Süyuti, “Tarixul-xuləfa”, səh. 191; İbn Quteybə, “əl-İmamə vəs-siyasə”, c. 1, səh. 184.

[70] “Fəthul-bari”, c. 13, səh. 55.

**qoydu. Onlar qarşılaşanda Həsən ona beyət etdi. Müaviyədən şərtləri yazdığı sonu möhürlü səhifəni istədi. Müaviyə imtina edərək yalnız əvvəlcədən qoyulan şərtlərlə razılaşdı. Mübahisə edərək əvvəlcədən qoyduğu şərtləri qəbul etdiyini dedi. Onların arasında ixtilaf yarandı. O, Həsənin iki şərtindən heç birinə əməl etmədi”**.[71]

Bu rəvayətə əsasən İmam Həsən (əleyhissalam) çoxlu şərtlər yazmışdı, lakin Müaviyə heç bir şərtə əməl etmədi.

**3. İbn Quteybə belə nəql edir.**

Bəlkə də şərtlərdən biri ondan sonra xilafətin qardaşı Hüseynə (əleyhissalam) verilməsi şərti idi. İbn Ənbə məhz bunu nəql edərək deyir: **“Onunla (Müaviyə ilə) bir neçə şərt kəsdi. Əgər (Müaviyə) bu şərtlərə əməl edəcəksə, xilafəti ona təhvil verəcəkdir. Bu şərtlərdən biri də bu idi ki, əgər onun başına bir iş gələrsə, xilafət ondan sonra Hüseynə verilməlidir”**.[72]

**4. İbn Əsir və Əbulfidanın nəql etdikləri**

Həmçinin, Müaviyənin əməl etmədiyi həmin şərtlərdən biri də Əmirəlmömininin İmam Əlinin (əleyhissalam) söyülməməsi idi. İbn Əsir məhz bunu nəql edərək deyir: **“Həsənin Müaviyədən tələb etdikləri Kufə beytul-malında məbləği beş min olan malın ona verilməsi, Fars məmləkətinin Əbcərd əyalətinin xəracının ona verilməsi və Əlini söyməmək idi. (Müaviyə) Əlini söyməyi tərk etməyi qəbul etmədi. Bundan sonra Həsən onun eşitdiyi halda söyməməsini tələb etdi. Müaviyə qəbul etdi, lakin sonradan buna da əməl etmədi”**.[73]

Əbulfida belə nəql edir: **“Həsən vəziyyəti belə gördükdə Müaviyəyə bəzi şərtlər göndərib belə dedi: “Əgər bu şərtləri qəbul etsən, mən eşidib itaət edəcəm”. Müaviyə onun dediklərini qəbul etdi. Həsənin Müaviyədən tələb etdikləri Kufə beytul-malında məbləği beş min olan malın ona verilməsi, Fars məmləkətinin Əbcərd əyalətinin xəracının ona verilməsi və Əlini söyməmək idi. Müaviyə Əlini söyməyi tərk etməyi qəbul etmədi. Sonra Həsən onun eşitdiyi halda söyməməsini tələb etdi. Müaviyə qəbul etdi. Sonradan buna da əməl etmədi”**.[74]

---

[71] “Fəthul-bari”, c. 13, səh. 55-56.
[72] İbn Ənbə, “Umdətut-talib”, səh. 67.
[73] İbn Əsir, “əl-Kamil fit-tarix”, c. 3, səh. 405.
[74] Əbulfida, “əl-Muxtəsər min əxbaril-bəşər”, c. 1, səh. 126.

## SÜLHÜN BƏNDLƏRİ

Qeyd etdiyimiz tarixi mətnlərdən aşağıdakı nəticələri əldə edirik:

**Birinci:** Müaviyə Allahın kitabı və Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) sünnəsinə əməl etməlidir.

**İkinci:** Özündən sonra heç kimi vəliəhd təyin etməməlidir. Bəzi mənbələrdə xilafət Müaviyədən sonra Həsənə (əleyhissalam), ondan sonra isə qardaşı Hüseynə (əleyhissalam) verilməlidir. Necə ki, İbn Ənbə belə nəql edir.

**Üçüncü:** İnsanlar Allahın yaratdığı yer üzündə, Şamda, Yəməndə, İraqda, Hicazda və ya harda olsalar əmin-amanlıqda olmalıdırlar.

**Dördüncü:** Əli tərəfdarları və şiələri harda olsalar da ailələri, uşaqları və malları əmin-amanlıqda olmalıdır.

**Beşinci:** Müaviyə İmam Həsənə (əleyhissalam) və qardaşı İmam Hüseynə (əleyhissalam), Peyğəmbər Əhli-beytindən olan hər hansı bir kəsə aşkarcasına və ya gizli şəkildə zülm etməməlidir. Həmçinin, yer üzünün hər hansı bir yerində olursa-olsun heç kəsə qorxu yaşatmağa haqqı yoxdur.

**Altıncı:** Müaviyə beş min dəyərində olan Kufənin beytul-malını və Fars məmləkətinin Əbcərd xəracını İmam Həsənə (əleyhissalam) verməlidir.

**Yeddinci:** Əmirəlmöminin Əli (əleyhissalam) söyülməməli və təhqir edilməməlidir.

## MÜAVİYƏNİN SÜLH MÜQAVİLƏSİNİ POZMASI

Lakin hakimiyyət Müaviyə üçün sabitləşdikdən sonra sülh müqaviləsini ayaqları altına atdı. Allahın kitabına və Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) sünnəsinə əməl etmədi. Özündən sonra vəliəhd təyin etməmək barədə olan əhd-peymanını pozdu. Özündə sonra xilafəti fasiqlikdə tanınan oğlu Yezidə həvalə etdi. Hətta iş o yerə çatdı ki, bağladığı bütün əhd-peymanı pozdu.

## MÜAVİYƏNİN KUFƏ CAMAATINA XİTABI

Müaviyə Kufə əhalisinə xitab edərək dedi:

**“Ey Kufə əhalisi, elə bilirsiniz ki, sizinlə namaz, zəkat, həcc üçün vuruşdum. Bilirəm ki, siz namaz qılır, zəkat verir və həccə gedirsiniz. Mən**

**sizə hakim olmaq və sizi ixtiyarıma keçirmək üçün sizinlə vuruşdum. Siz istəməsəniz də Allah bunu mənə bəxş elədi. Bu fitnədə gedən hər bir mal, tökülən hər bir qan hədərə getmişdir. Kəsdiyim hər bir şərt iki ayağımın altındadır”**.[75]

Həqiqətən də Müaviyə bütün şərtləri ayaqları altına atdı. Bir-birinin ardınca bütün şərtləri pozdu. Əgər onun əməllərini nəzərdən keçirsək və İmam Həsənin (əleyhissalam) şərtləri ilə müqayisə etsək görərik ki, bu şərtlərin heç birinə vəfalı olmamışdır.

Birinci şərtə gəlincə, Müaviyə Allahın kitabına və Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) sünnəsinə qarşı çıxdı. Çünki o, qeyd edəcəyimiz kimi öz hakimiyyəti dövründə dinə və şəriətə qarşı çıxmağından əlavə, bağladığı müqaviləyə əməl etmədi.

İkinci şərtə gəlincə, Müaviyə Yezidə beyət tələb etdiyi zaman onu da pozmuşdu. İbn Kəsir hicrətin 60-cı illərinin hadisələrini qeyd edərkən yazır: **“Həmin ili Müaviyə Übeydullah bin Ziyadla Dəməşqə gələn nümayəndədən oğlu Yezid üçün beyət aldı. Həmin ili Müaviyə rəcəb ayında tutduğu xəstəlikdən öldü”.**[76]

İbn Əbdülbirr deyir: **“Müaviyə Yezidə beyət edilməsini istəyirdi. Şam əhalisinə xitab edərək dedi: “Ey Şam əhalisi, artıq yaşlanmışam və əcəlim yaxınlaşıb. Xilafəti sizin işlərinizi tənzimləyəcək bir adama vermək istəyirəm. Mən sizlərdən biriyəm. Rəyinizi söyləyin”. Onlar əl çalıb bir yerə cəm olub dedilər: “Əbdürrəhman bin Xalidin olmasını istəyirik”. Bu, Müaviyəni narahat elədi, lakin biruzə vermədi. Sonra Əbdürrəhman xəstələndi. Müaviyə etibar etdiyi yəhudi təbibə əmr etdi ki, ona ölümlə nəticələnəcək bir dərman içirtsin. Təbib ona zəhər içirtdi. Onu qarın ağrısı tutdu və öldü”.**[77]

İsfəhani deyir: **“Müaviyə istəyirdi ki, oğlu Yezidə beyət olunsun. Həsən bin Əli və Səd bin Vəqqasdan başqa rəqibi yox idi. Onların hər ikisini zəhərlətdirdi. Hər ikisi zəhərdən vəfat etdilər”.**[78]

Budur, Müaviyə oğlu Yezidin xəlifəliyinə müxalif olanlara qarşı zəhərdən istifadə edir. Hər hansı bir qətl növündən istifadə etməkdən çəkinmir. Onun ən məşhur üslubu insanları zəhərəyərək öldürmək idi. O, insani olmayan bu iyrənc üslubla ən xeyirli səhabələri qətlə yetirirdi.

---

[75] İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 15; İbn Quteybə, “əl-İmamə vəs-siyasə”, c. 1, səh. 141; əl-Əmini, “əl-Ğədir”, c.10, səh. 326.
[76] İbn Kəsir, “əl-Bidayə vən-nihayə”, c. 8, səh. 123.
[77] İbn Əbdulbirr, “əl-İstiyab”, c. 2, səh. 830.
[78] “Məqatilut-talibin”, səh. 47.

Deməli, Müaviyə özündən sonra xilafətin İmam Həsənə və İmam Hüseynə verilməsi barədə bağladığı əhdi pozdu.

Üçüncü şərtə gəlincə, bu şərtə də əməl edilmədi. Onun hakimiyyəti dövründə insanlar əmin-amanlıq və sabitlik görmədilər. Müaviyənin siyasəti barədə Corc Cordaqın dediklərinə işarə etmək kifayətdir: **“Müaviyənin siyasətini diqqətlə nəzərdən keçirən şəxs onun insanları aradan götürmək üçün istifadə etdiyi şərr və hiylə qüvvəsindən dəhşətə gəlir. Onun üslubu eynilə Makyavellinin üslubudur. Qarət, qorxutmaq, hədələmək, həbs etmək, qətlə yetirmək kimi Makyavelli cinayətlərinin hamısı onda vardı”.**[79]

O, həmçinin deyir**: “Rəsulullah (səllallahu əleyhi və alihi və səlləm) necə də doğru buyurub: “Əgər As övladları otuz nəfərə çatsalar, Allahın malını qarət edər, Allah bəndələrini özlərinə qul edərlər”.**[80]

Müaviyə Şam, Hicaz, Yəmən və İraqda olmasından asılı olmayaraq hər hansı bir yerdə, hər hansı bir məkanda hər hansı bir əməli etməkdən çəkinmirdi. Onun Busr bin Ərtəyə dedikləri sözlər buna dəlildir.

**“Müaviyə onun yanından çıxdıqdan sonra Busr bin Ərtəyə xəbər göndərdi. Ona üç min əsgər verib dedi: “Mədinəyə tərəf hərəkət elə. Yol boyu bizə itaət etməyən insanları ev-eşiklərindən qov, gördüyün hər bir insanı qorxut, kimin malı varsa qarət elə. Mədinəyə girəndə özünü elə göstər ki, sanki sən heç bir üzrü qəbul etmədən onları qətlə yetirmək istəyirsən. Elə ki, sənin onları qətlə yetirəcəyinə inandılar, burax onları. Sonra Məkkəyə doğru hərəkət elə. Məkkədə heç kimə toxunma. Amma Mədinə ilə Məkkə arasında olan insanları qorxut. Elə et ki, hamısı qaçıb getsin. Sonra Səna (şəhərinə) get...”**[81]

Dördüncü şərtə gəlincə, Müaviyə İmam Əlinin (əleyhissalam) Əmmar bin Yasir, Hücr bin Udəy, Əmr bin Həmq kimi başqa tərəfdarlarını qətl etmək, onları sürgün etmək kimi əməllərindən çəkinmədi. Şeyx Həsən bin Fərhan Maliki deyir: **“Bəni Üməyyə Əhli-beytə məhəbbət bəsləyənləri alçatmağa və öldürməyə başladılar. Onlar Müaviyənin dövründə Hücr bin Udəyi amansızcasına qətlə yetirdilər. Çünki o, minbərə çıxıb Əlini söyməyə razılaşmadı. Əmr bin Həmq əl-Xuzaini qətlə yetirdilər. Halbuki o və həmçinin Hücr bin Udəy Peyğəmbəri (səllallahu əleyhi və alihi və səlləm) görənlərdən və onunla hicrət edənlərdən idilər. Cənnət cavanlarının ağası olan Həsən bin Əlini zəhərləyərək**

---

[79] Corc Cordaq, “Əli ədalət və insanlıq carçısıdır”, c. 4, səh. 757.
[80] Corc Cordaq, “Əli ədalət və insanlıq carçısıdır”, c. 4, səh. 757.
[81] İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 2, səh. 7.

**öldürdülər. Qardaşı  Hüseyni isə qılıncla qətlə yetirdilər və Kərbala qırğınını törətdilər..."**[82]

Şeyx Muğniyə deyir: **"İmam Əlinin Meysəm Təmmar, Kumeyl bin Ziyad, Hücr bin Udəy, Muhəmməd bin Əbu Bəkr və başqa ixlaslı həvariləri və səhabələri vardı. İmam Əli (əleyhissalam) xəlifəliyi dövründə daxili çəkişmələr və müharibələrlə üz-üzə qaldı. Elə ki, Rəbbinin hüzuruna getdi, Müaviyə onun gözəl əməllərini yaddaşlardan silməyə, yetişdirdiyi kadrları öldürməyə və onunla bağlı nə varsa hamısına son qoymağa başladı"**.[83]

Seyid İbn Əqil belə deyir: "Allahın qəzəbinə məruz qalacağı cinayətlərindən biri də Mərəcul-əzrada Hücr bin Udəy və onun tərəfdarlarını amansızcazına qətlə yetirməsidir. Onlar kimlər idi?! Sanki Allah-təalanın belə buyurduğunu eşitməyib: **"Kim bir mömini qəsdən öldürərsə (və bu əməli halal hesab edərsə), onun cəzası Cəhənnəmdir ki, orada əbədi qalacaqdır. Həmçinin Allah ona qəzəb edər, onu Öz rəhmətindən uzaqlaşdırar və onun üçün böyük bir əzab hazırlayar"** (Nisa surəsi, ayə 93). **Onlar aşağıdakı şəxslər idi. Şureyk bin Şəddad əl-Həzrəmi, Vəsvi bin Fəsil əş-Şeybani, Qəbisə bin Zəbiyyə əl-Əbəsi, Əbdürrəhman bin Həssan əl-Ənzi. Ziyad onları diri-diri qətlə yetirdi".**[84]

Tarixdə nəql edildiyinə əsasən, Aişə Müaviyənin Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) səhabələrini amansızca qətlə yetirməsindən dəhşətə gələrək demişdi: **"Sən Hücrü və onun tərəfdarlarını qətlə yetirdin. Qorxmursan ki, qardaşımı öldürdüyünə görə səni öldürəcək bir adam göndərim?" Müaviyə dedi: "Yox (qorxmuram). Mən əmin-amanlıq olan bir evdəyəm".**[85]

İbn Əbdulbirr nəql edir ki, Hücr bin Udəy yanında olan yaxınlarına demişdi: **"Mənə görə qılınc çəkməyin və qan yumayın. Mən Müaviyə ilə yolda görüşəcəm".**[86]

Həsən əl-Bəsri Müaviyənin əməlləri barədə yekun söz söyləmişdi. Təbəri həmin sözü belə nəql edir: **"Müaviyədə elə dörd xislət vardı ki, əgər bu dörd xüsusiyyətdən təkcə biri belə onda olsaydı, həlak olmasına kifayət edərdi. Bu ümmətə səfehləri hakim etdi. Hətta ümmətin içərisində səhabələr və fəzilət əhli olduğu halda məşvərət etmədən xəlifəliyi qəsb etdi. Şərab içən, ipək geyinən və ud çalan oğlu Yezidi özündən sonra xəlifə təyin etdi. Ziyadın**

---

[82] "Qiraətun fi kutubi əqaid", səh. 170.
[83] Şeyx Cavad Muğniyə, "əş-Şiə fil-mizan", səh. 110.
[84] Muhəmməd bin Əqil, "ən-Nəsaih əl-Kafiyə", səh.82.
[85] Buxari, "Tarixus-səğir", c. 10, səh. 121; İbn Əsakir, "Tarixu mədinəti Diməşq", c. 12, səh. 222; Təbərani, "əl-Mucəmul-kəbir", c. 19, səh. 319; "əl-Mustədrək aləs-səhiheyn", c. 3, səh. 470.
[86] "əl-İstiyab", c. 1, səh. 331.

**atasına nisbət verildiyini iddia etdi. Halbuki Rəsulullah (səllallahu əleyhi və alihi və səlləm) "övlad (qanuni nikahla olan) yatağa aiddir, zinakar daş-qalaq olunmalıdır" - deyə buyurmuşdu. Hücrü qətlə yetirmişdi. Hücrü və onun tərəfdarlarını qətlə yetirdiyi üçün ona vay olsun. Bunu iki dəfə təkrar etdi".**[87]

Müaviyənin əməlləri barədə danışsaq söhbət daha uzun olar. Əgər Müaviyənin amansızca qətlə yetirdiyi əməlisalehləri və Allah dostlarını, hiyləgərcəsinə məhv etdiklərini, sitəmlə yer üzündən sildiklərini, savaşla qırdıqlarını, zülmlə gözlərini çıxartdıqlarını, ələrini və ayaqlarını kəsdiklərini, haqq söyləyən dillərini dibindən çıxartdıqlarını, yalanla şəhadətlərini hökmdən düşürdüklərini, iftira ataraq əleyhinə danışdıqlarını, hiylə ilə halallarını boşatdırdıqlarını, əllərindən mallarını alaraq qarət etdiklərini, evlərinə girərək yağmaladıqlarını, evlərini bir gecədə başlarına yıxdıqlarını, sürgünə göndərdiklərini, zəlil etdiklərini, təcrid edərək həbs etdiklərini, diri-diri basdırdıqlarını, öldükdən sonra minbərdən lənət etdiklərini saymaq istəsək mürəkkəb qurtarar, səhifələr dolar yenə də məqsədimizə, istədiyimizə çatmış olmarıq.[88]

Beşinci şərtə gəlincə, Müaviyə yenə bu şərtə əməl etmədi. Onun zülmü İmam Həsəni (əleyhissalam) zəhərlətdirərək, həmçinin xilafətə gətirdiyi oğlu Yezid tərəfindən İmam Hüseynin (əleyhissalam) və Əhli-beytinin Kərbəlada qətlə yetirilməsilə zirvəyə çatmışdı. İbn Əbilhədid Hasin bin Munzirdən belə nəql edir: **"Allaha and olsun Müaviyə Həsənə heç nədə vəfalı olmadı. Hücrü və onun səhabələrini qətlə yetirdi, oğlu Yezid üçün beyət istədi və Həsəni zəhərlətdirdi"**.[89]

Təkcə Munavinin nəql etdiyi başda Müaviyə olmaqla Bəni Üməyyənin Əhli-beytə qarşı etdikləri zülm və cəfaları qeyd etmək yetərlidir:

**"Bəni Üməyyə Mustafanın (səllallahu əleyhi və alihi və səlləm) Əhli-beyti və ümməti barədə etdiyi tövsiyəyə müxalif çıxdı. Onların qanlarını tökdülər, qadınlarını və uşaqlarını əsir aldılar, ev-eşiklərini xarabalığa çevirdilər, şərəf və fəzilətlərini inkar etdilər, onların zürriyyətlərini əsir almağı və söyməyi mubah bildilər. Onlar Rəsulullahın (səllallahu əleyhi və alihi və səlləm) vəsiyyətinə müxalif çıxıb onun istəklərinin əksinə əməl etdilər. Peyğəmbərlə qarşılaşacaqları gün o həzrət onları utandıracaq və onları biabır edəcək".**[90]

---

[87] "Tarixu Təbəri", c. 4, səh. 208.
[88] Seyid Şərəfuddin, "əl-Fusulul-muhimmə fi təlifil-ummə", səh. 132.
[89] "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 17.
[90] Munavi, "Feyzul-qədir", c. 6, səh. 459.

Altıncı şərtə gəlincə, bu şərtə də Müaviyə əməl etmədi. İmam Həsənə Kufənin beytülmalını və Əbcərd xəracını vermədi. İbn Əsir belə yazır: **“Bu işdə də (Kufənin beytülmalının verilməsi) vəfalı olmadı. Əbcərd yurdunun xəracına gəlincə isə, Bəsrə əhalisi buna imkan vermədilər. “O bizim qənimətimizdir, heç kəsə vermərik” - dedilər. Onlar Müaviyənin əmri ilə belə etdilər”.**[91]

Həmçinin, Təbəri belə nəql edir: **“Bəsrə əhli Əbcərdin xəracı ilə onun (İmam Həsənə) arasına girib “bizim qənimətdir” - dedilər”.**[92] Yəni, bu şəhərin xəracının İmama verilməsinin qarşısını aldılar.

Yeddinci şərtə gəlincə, Müaviyə bu şərtə də əməl etmədi. Cahizin nəql etdiyinə əsasən, Müaviyə söylədiyi xütbədə demişdi: **“İlahi, Əbu Turab Sənin dinini inkar etmiş, yolunun qarşısını almışdır. Ona lənət elə və ona ağır əzab ver”. Sonra hər yerə məktub yazdı. Bu sözlər minbərlərdən deyilirdi”**.[93]

İbn Əqilin “ən-Nəsaih” kitabında nəql etdiyinə əsasən Süyuti deyir: **“Bəni Üməyyənin hakimiyyəti dövründə Müaviyənin qoyduğu qanuna əsasən yetmiş mindən çox minbərdən Əli bin Əbu Talibə (əleyhissalam) lənət oxunurdu”**.[94]

İbn Abbas kimi bir çoxları Müaviyəyə Əlini (əleyhissalam) lənət etməkdən çəkinməyi nəsihət etmişlər. (Bu barədə İbn Abbasın Müaviyəyə belə dediyi nəql olunur): “Bu kişini söyməkdən əl çəkməyəcəksən?” (Müaviyə) dedi: **“Allaha and olsun ki, yox. Ta ki, bu lənətlə uşaqlar böyüyə, böyüklər qocala”.**[95]

Müaviyə əminliklə bilirdi ki, Əlini (əleyhissalam) söymək şəni uca olan Allahı söymək deməkdir. O, Allah-təalanı söyənin hökmünü də bilirdi. Hakim “əl-Mustədrək” kitabında Ümmü Sələmədən belə nəql edir: “Mən Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) belə buyurduğunu eşitdim: **“Kim Əlini söyərsə, məni söymüşdür. Kim məni söyərsə, Allah-təalanı söymüş olar”.**[96]

Həmçinin, Əlinin fəzilətlərindən və Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) dili ilə onun barəsində nəql olunanlardan xəbərdar idi. Müslim “Səhih”ində Amir bin Səd bin Əbu Vəqqasın öz atasından belə nəql etdiyini yazır: **“Müaviyə Sədə (Əlini söyməyi) əmr etdi. (Laкin Sədin onun əmrinə tabe olmadığını gördüкdə) dedi: «Əbu Turabı (Əlini) söyməyə sənə nə mane olur?» Səd cavab verdi: «Allahın Peyğəmbərinin (səllallahu əleyhi və alihi və səlləm) (Əli haqqında) dediyi üç şeyi xatirladım. Ona görə də mən onu heç vaxt**

[91] İbn Əsir, “əl-Kamil fit-tarix”, c. 3, səh. 405.
[92] “Tarixu Təbəri”, c.4, səh. 126.
[93] “Şərhu nəhcil-bəlağə”, c. 4, səh. 56.
[94] “ən-Nəsaih əl-Kafiyə”, səh. 104.
[95] Cahiz, “əl-Usmaniyyə”, səh. 285.
[96] “əl-Mustədrək aləs-səhiheyn”, c. 3, səh. 121.

**söyməyəcəyəm. Əgər o üç şeydən biri məndə olsa, (bu) mənim üçün qırmızı rəngli dəvə sürüsündən daha sevimli olar. (Belə кi,) müharibələrin birində (Təbuк müharibəsində) Allahın Peyğəmbəri (səllallahu əleyhi və alihi və səlləm) onu öz yerinə canişin təyin etdiкdə Əli ona dedi: «Ey Allahın Peyğəmbəri! Məni qadınların və uşaqların içərisində qoyub gedirsən?» Allahın Peyğəmbəri (səllallahu əleyhi və alihi və səlləm) dedi: «(Ey Əli!) Məgər sən mənə olan nisbətinin (eynilə) Harunun Musaya nisbəti кimi olmasına razı deyilsən? Laкin (aramızdaкı yeganə fərq odur кi,) məndən sonra peyğəmbərliк olmayacaqdır».**

**(Yaxud) Xeybər (müharibəsi) günü (Peyğəmbərin) belə dediyini eşitdim: «Sabah bayrağı elə bir adama həvalə edəcəyəm кi, o, Allahı və Onun Peyğəmbərini sevir, Allah və Onun Peyğəmbəri də onu sevirlər». Nəhayət, (səhər açıldı və) biz (hansımızın bu şərəfə nail olacağını görməк üçün) bayrağa tərəf boylanıb durduq. (Peyğəmbər:) «Əlini yanıma çağırın», - dedi. (Əli) onun yanına gəldi. Onun gözləri ağrıyırdı. (Peyğəmbər mübarəк) ağzının suyundan onun gözlərinə sürtdü. Sonra bayrağı ona həvalə etdi».**

**Həmçinin, «Siz ey (Peyğəmbərin) əhli-beyti! Allah yalnız sizdən çirкinliyi yox etməк və sizi tərtəmiz (paк) etməк istər!» - (ayəsi) nazil olduqda Allahın Peyğəmbəri (səllallahu əleyhi və alihi və səlləm) Əlini, Fatiməni, Həsəni və Hüseyni yanına çağırıb: «Ey Rəbbim! Mənim əhli-beytim bunlardır», - dedi".**[97]

Lakin Müaviyənin Haşimi evinə olan kin-küdurəti onun qulaqlarını kar etmişdi. **"Haşimilərin haqlarını aşkarcasına bildiyi halda onlara bəslədiyi kin-küdurət ürəyini yeyib param-parça edirdi. Həmçinin, Muhəmmədə (səllallahu əleyhi və alihi və səlləm) olan nifrət onun nəfəsini daraldırdı. Amma baş vermiş bir hadisə üçün nə edə bilərdi".**[98]

Kamil Süleymanın dediyi bu sözlər həqiqətən də ən doğru şahiddir. Bəlkə də İmam Əli bin Hüseynin (əleyhissalam) sözlərindən götürmüşdür. İmam Mərvan bin Həkəmdən belə soruşmuşdu: **"Nə üçün siz onu – Əli (əleyhissalam) – minbərlərdən söyürsünüz?" (Mərvan bin Həkəm) dedi: "Bizim işimiz yalnız bu yolla qaydasına düşür".**[99]

Onların işlərinin qaydasına düşməsi hakimiyyət və səltənətə işarədir. Lakin bu onlara qismət olmadı. Artıq Müaviyənin adı belə xatırlanmır, yanar odu sönmüşdür. Əlinin (əleyhissalam) isə şəni daha uca, məqamı daha da yüksəlmişdir.

---

[97] "Səhih Müslim", c. 7, səh. 120; "Sünəni Tirmizi", c. 5, səh. 301.
[98] "Həsən bin Əli", səh. 180.
[99] "Həsən bin Əli", səh. 283.

Müaviyə tarixin zibilliyində, Əli (əleyhissalam) isə səmada, əbədi parlayan bir yüksəklikdədir...

## MÜAVİYƏ SÜLH MÜQAVİLƏSİNİ POZDUQDAN SONRA XƏYANƏTLƏ VƏSF OLUNDU

Müaviyə heç bir şərtə əməl etməyərək hamısını ayaqları altına atdı. Buna görə də bəzi səhabələr Müaviyəni xəyanətkar adlandırdılar. Əbulfərəc İsfəhani belə yazır: "Əmr bin Sabit Əbu İshaqdan belə nəql edir: "Müaviyənin Nuxeylədə belə dediyini eşitdim: **"Həsən bin Əliyə verdiyim hər bir şey (bütün sözlər) bu iki ayaqlarımın altındadır. O şərtlərə əməl etməyəcəm". Əbu İshaq deyir: "Allaha and olsun ki, o, xəyanətkar idi".**[100]

Şərtləri pozmaq, səhabələri zəhərləmək, qətlə yetirmək və oğlu Yezidi xilafətə başçı gətirmək kimi xəyanət və verdiyi sözə əməl etməmək həyatı boyu Müaviyənin xüsusiyyəti olmuşdur.

## SÜLHÜN SƏBƏBLƏRİ

İmam Həsənin (əleyhissalam) sülh bağlamasına səbəb olan əsas nöqtələr aşağıdakılardı:

### 1. Kufə ordusunun vəziyyəti

İmam Həsənin (əleyhissalam) Müaviyə ilə müharibə üçün təşkil etdiyi Kufə ordusu müxtəlif qruplardan ibarət idi. Şeyx Mufid deyir: **"İmam Həsən (əleyhissalam) Hücr bin Udəyə tapşırdı ki, tərəfdarlarına hərəkət etmək əmrini çatdırsın. İnsanlar cihad etmək istəmirdilər. (Səfərbərlik) əmrini yerinə yetirməkdə ləngiyirdilər. Sonra qarışıq insanlar cəm oldular. Bəziləri İmamın (əleyhissalam) və atasının (əleyhissalam) şiələri, bəziləri hər nə vəchlə olsun Müaviyəni qətlə yetirmək istəyən muhəkkimə camaatı, bəziləri fitnə və qənimət güdənlər, bəziləri şübhədə olanlar, bəziləri isə dinə bağlılıqları olmayan və qəbilələrinin başçılarına tabe olan təəssübkeş insanlar idi".**[101]

Həmçinin, gizlincə Müaviyəyə məktub yazan münafiqləri, onun dinar və dirhəmləri müqabilində vicdanlarını satan xainləri də unutmamalıyıq. Kufənin müxtəlif qruplaşmalardan ibarət ordusunun sayı nə qədər çox olsa da istənilən ordu onu məğlubiyyətə uğrada bilərdi. İmam ordusunu yad ünsürlərdən "təmizləmək"

---

[100] "Həsən bin Əli", səh. 283; "Məqatilut-talibin", səh. 45.

[101] "əl-İrşad", c. 2, səh. 10; İbn Səbbağ əl-Maliki, "əl-Fusulul-muhimmə fi mərifətil-əimmə", c. 2, səh. 720.

iqtidarında deyildi. Həmin dövrdə səfərbərlik metodunda şəxsi göstəricilər, hətta yaş həddi belə nəzərə alınmırdı. Həmçinin, döyüşçünün müharibənin məram və məqsədinə nə dərəcədə inandığını isbat etmək üçün yoxlanılması mümkün deyildi. Sadəcə silah daşıya bilməsi əsas hesab olunurdu. Həmin dövrün metodu belə idi. Belə ki, döyüşçünün zahiri xüsusiyyətlərinə etimad edilirdi. Hərbi təhlükəsizlik sistemi yox idi ki, səmimi olmayan ədavətli ünsürləri ortaya çıxarıb məhv edə bilsin.

Bu, heç də yeni məsələ deyildi. Peyğəmbərin (səllallahu əleyhi və alihi və səlləm) zamanında qərəzli münafiqlər onunla döyüşlərdə iştirak edirdilər. Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm) onları qovmamış və ya ifşa etməmişdir.[102]

Deməli, İmam Həsənin (əleyhissalam) ordusunun müxtəlif qruplaşmalardan təşkil olunması onun zəifliyində əhəmiyyətli rol oynayırdı. Məhz bu səbəbdən bu ordu mütəşəkkil Şam ordusunun qarşısında aciz qalaraq öz vəzifəsini yerinə yetirə bilmədi.

**2. Ordu başçılarının xəyanəti**

Ordunun mənəviyyatını zəiflədən ən əsas səbəb və onurğa sütununu sındıran amillərdən biri də İmam Həsənin (əleyhissalam) təyin etdiyi və ön cəbhəyə göndərdiyi ordu başçılarının xəyanəti idi. Lakin Müaviyənin dirhəmləri qarşısında onların ağız suyu axdı və onun tərəfinə keçdilər.

Həmin ordu başçılarından ən əhəmiyyətlisi Übeydullah bin Abbas idi. Müaviyə onu satın almaq üçün 1 milyon dirhəm sərf etməli oldu. O, səkkiz min adamı ilə Müaviyənin tərəfinə keçdi.[103] Bu xəyanətlərin ordunun mənəviyyatının zəifləməsində və sayının azalmasında böyük rolu vardı. Nəticədə iki ordu arasında qeyri-bərabərlik yarandı.

**3. Ardıcıl müharibələr səbəbindən yorulmuş ordu.**

Kufə əhalisi qısa müddət ərzində - Əmirəlmöminin Əlinin (əleyhissalam) xəlifəliyi dövründə - dəhşətli döyüşlərə qatılmışdı. Bu, Kufə cəmiyyətində dərin yaralar açmışdı. Belə ki, on minlərlə Kufə övladları şəhid olmuşdular. Təkcə Cəməl[104] döyüşündə ən azı onlardan beş min nəfər qətlə yetirilmişdi. Bəzi məlumatlara əsasən 10 və ya 15 minədək qətlə yetirilən olmuşdu. Nəql olunan məlumatlara əsasən iki qoşundan qətlə yetirilənlərin birgə sayı 30 mindən çox

---

[102] İbn Əsir, "əl-Kamil fit-tarix", c. 2, səh. 192, 263; Daha geniş məlumat üçün bax: Şeyx Razi Ali Yasin, "Sulhul-Həsən", səh. 126.
[103] "Tarixu Yəqubi", c. 2, səh. 214.
[104] "Tarixu Təbəri", c. 3, səh. 543.

idi.[105] Siffin döyüşünə gəlincə isə, Kufə əhalisindən qətlə yetirilənlərin sayı 20 mindən 25 minədək idi.[106] Kufə əhalisi Nəhrivan döyüşündə daha çox şəhid verməyə hazır idi. Lakin Allah-təala onları qorudu.

Çoxlu sayda qətlə yetirilənlər, döyüşlər nəticəsində yaranan psixoloji sıxıntı, bundan əlavə ardıcıl döyüşlər nəticəsində yaranan iqtisadi problemlər və bütün bunlar Kufə əhalisini yorulmalarına, döyüşməyib sülh istəmələrinə, hətta "Yaşamaq! Yaşamaq!" deyə çığırmalarına gətirib çıxartdı.[107]

**4. Şaiyələrin yayılması və daxili çəkişmələr**

Kufə ordusunu zəiflətmək üçün Müaviyənin etimad etdiyi üslublardan biri də şaiyələr yaymaq idi. Belə ki, o, İmam Həsənlə (əleyhissalam) hələ razılaşmadan əvvəl onun sülh sazişi bağlamağa razı olması barədə Kufə ordusunda şaiyə yaymışdı. Yəqubi yazır: **"Müaviyə Həsənin başçılıq etdiyi qoşunun içərisinə casus yerləşdirmişdi ki, Qeys bin Sədin Müaviyə ilə razılaşıb onun tərəfinə keçməsi barədə şaiyə yaysın. Eyni zamanda Qeysin başçılıq etdiyi orduya casus göndərmişdi ki, Həsənin artıq Müaviyədən sülh istəməsi və onun da razı olması barədə şaiyə yaysın. Müaviyə Muğirə bin Şöbəni, Abdullah bin Amir bin Kərizi və Əbdürrəhman bin Ümmü Həkəmi Həsənin yanına elçi olaraq göndərdi. İmam Mədaində olanda onun yanına gəldilər. Onun yanından çıxdıqdan sonra sonra camaata: "Allah Peyğəmbər övladının sayəsində qan tökülməsinin qarşısını aldı və onun vasitəsilə fitnənin odunu söndürdü. Artıq o, sülhü qəbul etdi" - dedilər".**[108]

Müaviyənin yaydığı bu şaiyələr İmamın (əleyhissalam) ordusunun içərisində şək-şübhə, iztirab və qalmaqal yaratdı. Nəticədə İmam Həsənin (əleyhissalam) həyatı təhlükəyə məruz qaldı. Tarix kitablarında qeyd olunur:

**"Həsən Mədaində olduğu vaxt carçı orduda belə car çəkdi: "Artıq Qeys bin Səd qətlə yetirilib. Dağlışıb gedin". Döyüşçülər çıxıb getməyə başladılar. İmam Həsənin (əleyhissalam) çadırını qarət etdilər. Hətta üzərində oturduğu xalçanı belə çəkib apardılar".**[109]

İmamı sülh bağlamağa vadar edən səbəblərin xülasəsi bunlardır. Həmin vaxt vəziyyət olduqca pis idi. İmam həmin vəziyyət haqqında danışaraq buyurur:

---

[105] "Tarixu Yəqubi", c. 2, səh. 183.
[106] Məsudi, "Murucuz-zəhəb", c. 2, səh. 404, 405.
[107] İbn Əsir, "əl-Kamil fit-tarix", c. 3, səh. 406.
[108] "Tarixu Yəqubi", c. 2, səh. 214, 215.
[109] "Tarixu Təbəri", c. 4, səh. 122.

**“Allaha and olsun ki, əgər Müaviyə ilə vuruşsaydım, məni boğazımdan tutub ona təslim edərdilər”.**[110]

Sülh sazişinin səbəblərini bildikdən sonra bu nəticəyə gəlirik ki, İmam xilafəti Müaviyəyə könül razılığı ilə təhvil verməmiş, buna məcbur olmuşdu. Əgər işlər onun ixtiyarında olsaydı və ordu ona itaət etsəydi sülh bağlamaz, Müaviyə ilə sonunadək vuruşardı. İmam Həsən (əleyhissalam) Kufə əhalisinə xitab edərək buyurmuşdu:

**“Müaviyə bizi elə bir işə dəvət edir ki, onda nə izzət var, nə də ədalət. Əgər ölümü seçsəniz, bu təklifi geri qaytarar və qılıncımızın ucu ilə onu Allahın mühakiməsinə verərik. Əgər həyatı seçsəniz, qəbul edib sizin razılığınızı əsas götürərik”.[111]**

## SÜLHÜN NƏTİCƏLƏRİ VƏ FAYDALARI

Sülh sazişinin ən əhəmiyyətli nəticə və faydaları aşağıdakılardan ibarətdir.

**1. Ümmətin islah olunması və müsəlmanların qanının tökülməsinin qarşısının alınması.**

Bu barədə İmam Həsən (əleyhissalam) sülhdən sonra söylədiyi xütbədə buyurur:

**“Ey insanlar, Allah bizim birincimizlə sizi hidayət etdi, sonuncumuzla qan tökülməsinin qarşısını aldı. Şübhəsiz ki, ən gözəl zəka təqva, ən böyük acizlik isə fasiqlikdir. Mən və Müaviyənin aramızda ixtilaf düşdüyü bu məsələdə ya o, bu mənsəbə məndən daha çox haqı idi, ya da mən haqqımı Allah rızası, Muhəmmədin ümmətini islah etmək və qanınızın tökülməməsi üçün tərk etdim”. Sonra (İmam) üzünü Müaviyəyə çevirdi və dedi: “Bilmirəm, bəlkə də sizin üçün bir fitnə və müəyyən müddətədək dünya ləzzətdir”. Müaviyə dərhal onun (minbərdən) enməsini tələb etdi.**[112]

Əgər bu sözləri diqqətlə nəzərdən keçirsək, görərik ki, İmam Həsən (əleyhissalam) ümməti onunla Müaviyə arasında baş verən sülhün mahiyyətini dərk etməyə, haqla batili bir-birindən seçməyə səsləyir. Ya Müaviyə, ya da İmam haqlıdır. Lakin o, daha əhəmiyyətli bir iş üçün öz haqqından keçmişdir. Çünki bu sülh qeyd edəcəyimiz kimi ümmətin islah olunması üçün idi. Sonra İmam bildirdi ki, bu sülh imaməti anlamayanlar üçün fitnə və imtahandır. İmam haqqın onunla

---

[110] Təbərsi, “əl-İhticac”, c. 2, səh. 10.
[111] İbn Əsakir, “İmam Həsənin tərcümeyi halı”, səh. 179; “Tarixu İbn Xəldun”, c.2, səh. 187.
[112] İbn Əsir, “Usdul-ğabə”, c. 2, səh. 14; Süyuti, “əd-Durrul-mənsur”, c. 4, səh. 342; “Fəthul-bari”, c. 13, səh. 54.

olmasını, lakin islahat və qan tökülməsinin qarşısını almaq üçün öz haqqından keçməsini aşkarca bəyan etdi. Məhz buna görə də Müaviyə onun minbərdən enməsini əmr etdi.

Süleyman bin Surəd İmama (əleyhissalam) xitab edərək dedi: **“Əgər istəyirsən müharibəni başlayaram. İcazə ver səninlə Kufəyə gəlim”. İmam (əleyhissalam) buyurdu: “Siz bizim şiələrimiz və bizi sevənlərsiniz. Müaviyə məndən nə güclü, nə də məğrur, nə də ki, iradəli deyil. Lakin mən sizin görmədiyinizi görürəm. Bu etdiklərimdən məqsəd qan tökülməsinin qarşısını almaqdır. Allah-taalanın qəzavü-qədərinə razı, əmrinə təslim olun. Evinizdə oturun və heç nə etməyin”.**[113]

Seyid Murtəza bu kəlama işarə edərək deyib: **“İmamın (əleyhissalam) bu sözləri qəlblərə şəfa verir və bütün şübhələri aradan aparır”.**[114]

Həmçinin, İmamdan (əleyhissalam) Müaviyənin hiyləgər və azğın olduğunu bildiyi halda onunla yumşaq davranmasının və sülh bağlamasının səbəbi barədə soruşmuşdular:

**“Ey Peyğəmbərin övladı, niyə Müaviyə ilə yumşaq davranıb onunla sülh bağladın? Halbuki haqqın səninlə olduğunu və Müaviyənin azğın və zalım olduğunu bilirdin”. İmam buyurdu: “Ey Əbu Səid, mən Allahın yaratdıqları üzərində höccəti və imamı deyiləmmi?” Mən: “Şübhəsiz” – deyə cavab verdim. İmam dedi: “Allah Rəsulu (səllallahu əleyhi və alihi və səlləm) mənim və qardaşım barəsində “Həsən və Hüseyn qiyam etsələr də, etməslər də imamdırlar” –deyə buyurmamışdırmı?” Dedim: “Şübhəsiz”. İmam dedi: “Deməli mən qiyam etsəm də imamam, qiyam etməsəm də imamam. Ey Əbu Səid, mənim Müaviyə ilə sülh bağlamağımın səbəbi Rəsulullahın (səllallahu əleyhi və alihi və səlləm) Bəni Zəmrə və Bəni Əşcə və Hüdeybiyyədən gedərkən Məkkə əhli ilə sülh bağlamasının səbəbi kimidir. Onlar tənzilə (Qurani-kərimin zahiri enişinə) küfr edirdilər, Müaviyə və onun tərəfdarları isə təvilə (Qurani-kərimin batini mənasına) küfr edənlərdi. Sizin mənə acıqlı olmanız bu işin hikmətini bilməmənizdəndir. Əgər (xilafəti təhvil) verməsəydim, yer üzərində qətlə yetirilməmiş bir şiəmiz belə qalmazdı”**.[115]

Həmçinin Səduq öz sənədilə Əbu Səiddən belə nəql edir: **“Həsən bin Əli (əleyhissalam) Müaviyə bin Əbu Süfyanla sülh bağladıqda insanlar imamın yanına gəldi, bəziləri onu beyət etdiyinə görə danladılar. İmam (əleyhissalam)**

[113] Seyid Murtəza, “Tənzihul-ənbiya”, səh. 330-331.
[114] Seyid Murtəza, “Tənzihul-ənbiya”, səh. 330-331.
[115] Səduq, “İləluş-şərai”, c. 1, səh.211.

**buyurdu: “Vay olsun sizə! Nə etdiyimi bilmirsiniz. Allaha and olsun ki, etdiyim iş günəşin üzərinə doğub batdığı hər şeydən daha xeyirlidir”.**[116]

Həmçinin, İmam Sadiq (əleyhissalam) Mumin Taq adı ilə tanınan Əbu Cəfər Muhəmməd bin Numan əl-Əhvələ tövsiyə edərkən belə buyurduğu nəql olunur: **“Bunu bil ki, Həsən bin Əli (əleyhissalam) yaralandıqdan, insanlar ondan üz döndərdikdən sonra xilafəti Müaviyəyə təhvil verdi. Şiələr ona dedilər: “Salam olsun sənə, ey şiələri zəlil edən!” İmam isə belə dedi: “Mən möminləri zəlil edən deyiləm, onları izzətli edənəm. Mən sizin onlara gücünüzün yetməyəcəyini gördükdən sonra xilafəti təhvil verdim ki, mən və siz onların arasında sağ qalaq. Necəki (Musa ilə olan) alim gəmini deşdi ki, gəmidəkilər sağ qalsınlar. Mən də belə elədim ki, siz və mən sağ qalaq”**.[117]

Budur, İmam Həsən (əleyhissalam) ona xəyanət edən ümmətlə son dərəcə mərhəmət və lütflə davranır. Onlara əyildikdən sonra izzət hiss etdirmək istəyir. Onların Müaviyəyə qarşı vuruşmağa kifayət qədər güclərinin yetmədiyini bildirir. Onların zəif olduğunu bilirdi. Lakin onlara demək istəyir ki, sülh bağlamağın səbəblərindən biri də sizsiniz. Bu, sizin qorunmanız üçün idi. Sonra da Qurani-kərimdən olduqca gözəl bir məsəl çəkir. Gəminin sərnişinlərinin qorunması və gəminin onların əlindən alınmaması üçün gəmini deşmək.

**2. Qurani-kərimlə bərabər tutulan ikinci əmanət – peyğəmbər sünnəsinin qorunması.**

İmam Həsən (əleyhissalam) bu sülhün sayəsində İmam Əlinin (əleyhissalam) həyatda qalan sevənlərini, əhli-beytini və şiələrini qoruyub saxlaya bildi ki, bəlkə bu yolla onlar Əhli-beyt elmlərini və həyat tərzlərini insanlar arasında nəşr edə bilsinlər. Çünki bu yolla kiçik əmanəti, Qurani-kərimin yoldaşını qorumaq mümkündür. Yazıçı Həsən bin Fərhan əl-Maliki məhz buna işarə edərək deyir: **“Həsən bin Əlinin qarşısında iki yol vardı. Ya az saylı ixlaslı tərəfdarları ilə çoxsaylı orduya qarşı vuruşmalı, ya da Müaviyə ilə sülh balamağa razılaşmalı idi. İmam Əlini (əleyhissalam) və əhli-beytini sevənləri qoruyub saxlamaq və bu yolla Əhli-beyt elmlərini və həyat tərzlərini insanlar arasında yaya bilmələri üçün Həsənin nəzərində ikincinin seçimi daha üstün oldu. Birinci yolu seçmək (Müaviyə ilə döyüşmək) İraq əhalisi arasında İmam Əlini xeyirlə yad edənlərin məhvi demək idi. Bununla da Allahın kitabından sonra ikinci əmanətin fəzilət və izi tamamilə aradan gedəcəkdi”.**[118]

---

[116] Səduq, “Kəmalud-din və təmamun-nimə”, səh. 316; Ərbili, “Kəşful-ğummə”, c. 3, 328.
[117] İbn Şöbə Hərrani, “Tuhəful-uqul”, səh. 308.
[118] Həsən bin Fərhan əl-Maliki, “Qiraətun fi kutubil-əqaid”, səh. 70, 71.

Sülh Əhli-beytlə tərənnüm olunan ikinci əmanətin qorunması, həyatın elmi, ictimai, siyasi  və bütün sahələrində onların fəzilət və irslərini yaymaq üçün idi.

**3. Sülh sazişi sayəsində Müaviyənin ifşa olunması**

Müaviyə ilə bağlanan sülhün nəticələrindən biri də onun ifşa olunması, münafiqliyinin və xəyanətinin bəyan olunması, onun xəlifəliyə haqlı olmasına aldanan müsəlmanların qarşısında həqiqətin üzə çıxması idi. İmam Həsən (əleyhissalam) Müaviyə ilə elə şərtlər kəsmişdi ki, o bu şərtləri pozmaqla həqiqi simasını ortaya çıxaracaqdı. Həqiqətən də o, həmin şərtlərə əməl etmədi. Bu da müsəlmanlarda ona qarşı şəkk-şübhə yaratdı. Hətta səhabələrdə və tanınmış tabeinlərdə onun barədə şübhələr yarandı. Belə ki, Əbdürrəhman bin Şureyk ən-Nəxəi bu barədə danışarkən belə deyir: **“Allaha and olsun ki, bu, onun ifşa olunmasıdır”.**[119]

**Müaviyə İmam Həsənin (əleyhissalam) nəzərində**

İmam Həsən (əleyhissalam) Müaviyə ilə özünü müqayisə edərkən onun həqiqi qiymətini vermişdi. Bu müqayisə Müaviyənin yalan, nifaq, hiylə və xəyanət baxımından şəxsiyyətini insanlara aşkar etdi. İbn Əbilhədid deyir: “Əbulfərəc deyir: “Əbu Ubeyd Muhəmməd bin Əhməd  Fəzl bin Həsən Bəsridən, o da Yəhya bin Muindən, o da Əbu Həfs əl-Ləbandan, o da Əbdürrəhman bin Şureykdən, o da İsmail bin Əbu Xaliddən, o da Həbib bin  Əbu Sabitdən onun belə dediyini nəql edir: **“Müaviyə Kufəyə daxil olanda xütbə söylədi. Həsən və Hüseyn minbərin yanında oturmuşdular. (Müaviyə) Əlinin adını çəkib onu təhqir elədi. Sonra Həsəni təhqir elədi. Hüseyn ayağa qalxıb ona cavab vermək istədikdə Həsən onun əlindən tutub əyləşdirdi. Sonra özü ayağa qalxıb dedi: “Ey Əlini xatırlayan, mən Əli oğlu Həsənəm. Sən Müaviyəsən, atan isə Səxərdi. Mənim anam Fatimə, sənin anan isə Hinddir. Mənim babam Rəsulullah, sənin  baban isə Utbə bin Rəbiədir. Mənim nənəm Xədicə, sənin nənən isə Qətilədir. Allah bizim zikrimizi inkar edənə, soyumuzu pisləyənə, keçmişdə və gələcəkdə bizə şər atana, küfr və nifaqla bizə tərəf gələnə lənət eləsin. Məsciddə olan bir dəstə:  “Amin” - dedilər”.**

**Fəzl deyir: Yəhya bin Muin deyir: “Mən də amin deyirəm”.**

**Əbulfərəc Əbu Ubeydin belə dediyini nəq edir: “Fəzl: “Mən də amin deyirəm” demişdir”.**

**Əli bin Hüseyn İsfəhani deyir: “Amin”.**

---
[119] Muhəmməd bin Əqil, “ən-Nəsaih əl-Kafiyə”, səh. 194.

**Mən, bu kitabın müəllifi Əbdulhəmid bin Əbilhədid deyirəm: “Amin”.**[120]

Deməli, İmam Həsən (əleyhissalam) xəstəliyi müəyyən edib düzgün müalicə təyin edən həkim kimi hər bir şeyi öz yerində etmişdi. Bu sülh sazişi İmam Həsənin (əleyhissalam) könül xoşluğu ilə xilafəti Müaviyəyə təhvil vermədiyinə dəlalət edir və insanlar üçün Müaviyənin həqiqi simasının ifşa olunmasında əhəmiyyətli rol oynamışdır.

### 4. İmam Hüseynin (əleyhissalam) Kərbaladakı qiyamına hazırlıq

Kamil Süleyman deyir: **“Sülhün yaratdığı ilk sıçrayışın olacağı gün Kərbəla idi... Bu sıçrayış Həsənin Müaviyə ilə Allahın kitabına əməl etmək şərti qoyub sülh bağladığı gündən başladı. Müaviyə Allahın kitabına, “Onları atalarına nisbət verin” ayəsinə müxalif çıxaraq uşağın anasına aid olmasına hökm verdi. Ziyadı özünə aid etdiyi gün hər ikisi birlikdə ata (Əbu Sufyan) ilə ana (Suməyyə) arasındakı zinanı qəbul etdilər! Bu sıçrayış Müaviyənin Peyğəmbərin sünnəsinə və “Uşaq şəri nikahla olan yatağa aiddir, zinakar daşqalaq olunmalıdır” sözünə müxalif olması ilə başladı... Bu hərəkat Müaviyə xilafəti Həsən və ya Hüseynə vəd edəcəyinə razı olub birincini zəhərlətdirib, ikincini qətlə yetirməyə çalışdığı zamandan başladı. Bu hərəkat Müaviyənin “hər yerdə insanlar əmin-amanlıqda olmalıdırlar” şərtinə razı olduqdan sonra insanları sürgün və qətllə qorxu içində yaşatması ilə başladı. O gün başladı ki, çox vədlər verib heç birinə əməl etmədi...”**[121]

Deməli, qeyd edilənlərdən məlum oldu ki, müsəlmanların qanlarının tökülməsinin qarşısının alınması və namuslarının qorunmasını nəzərə alsaq, sülhün nəticələri və faydaları onlara qayıdır. Həmçinin, Qurani-kərimdən ayrılmayan əhli-beytlə tərənnüm olunan ikinci əmanətin qorunmasında, dinlə heç bir bağlılığı olmayan Yezidin xilafətə gəlməsində tərənnüm olunan əməvi azğınlığını ifşa edən İmam Hüseynin (əleyhissalam) inqilabının yaranmasına zəmin yaratmışdı.

---

[120] İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 46, 47; “Məqatilut-talibin”, səh. 46; “əl-İrşad”, c. 2, səh. 15; İbn Şəhr Aşub, “əl-Mənaqib”, c. 3, səh. 198.
[121] Kamil Süleyman, “Həsən bin Əli”, səh. 120.

## ÜÇÜNCÜ FƏSİL

## İMAM HƏSƏNİN (əleyhissalam) BAĞLADIĞI SÜLH BARƏDƏ ŞÜBHƏLƏR

**Birinci şübhə:**

**Xilafətin Müaviyəyə təhvil verilməsi imamətin təyin yolu ilə olmadığına dəlildir.**

Doktor Nasir bin Abdullah əl-Qəffari yazır: **"Həsən və Hüseyn məcbur olmadan, könül xoşluğu ilə (Allah onlardan razı olsun) Rəsulullahın (səllallahu əleyhi və alihi və səlləm) onlara (xilafət barədə) olan əhdini pozmağı necə halal hesab edə bilərlər? Halbuki Həsənin uğrunda öləcək yüz min insan var idi?!"**.[122]

Sonra belə deyir: **"Allaha and olsun ki, Həsən (Allah ondan razı olsun) xilafəti Müaviyəyə təhvil verməkdə və ya verməməkdə ixtiyar sahibi olsaydı, bu iki işi (həm xəlifə olması, həm də xilafəti Müaviyəyə verməsi) etməzdi . Altı ay xilafəti özündə saxladı. Çünki bu, onun haqqı idi. Sonra zərurət olmadan xilafəti təhvil verdi. Bu, onun üçün mubah idi. Şübhəsiz ki, bu, daha yaxşı idi. Çünki babası Rəsulullah (səllallahu əleyhi və alihi və səlləm) bu barədə minbərdən xütbə edərək buyurmuşdu: "Mənim bu oğlum ağadır. Bəlkə də Allah-taala onun vasitəsilə müsəlman olan iki böyük dəstə arasında sülh elədi". Bu hədisi Buxaridən nəql edirik".**[123]

**Şübhənin cavabı:**

**Siyasi imamətlə ilahi imaməti bir-birindən fərqləndirməmək.**

Doktor Qəffari iki əsas məsələni bir-birindən fərqləndirməmiş və onları qarışdırmışdı. Bəlkə də o, bu mənanı dərk etmək iqtidarında deyil. Ona görə də söhbətini imamətin düzgün olmayan məfhumu üzərində qurmuşdu. Nəticədə, şübhə yaradaraq İmam Həsənin (əleyhissalam) xəlifəlikdən imtina etdiyini söyləyir. Guya İmam xilafəti Müaviyəyə öz razılığı ilə verib. Bu yanaşma şiə əqidəsi nöqteyi-nəzərdən düzgün deyil.

---

[122] Səudiyə ərəbistanı Ummul-Qura universitetinin əqidə elmləri üzrə doktoru. Sələfidir. Şiə məzhəbinə qarşı bir neçə kitab yazmışdı. Həmin kitablardan biri də onun doktorluq araşdırması olan "On iki imamçı şiə məzhəbinin əsasları – təqdim və tənqid" kitabıdır.

[123] "Usulu məzəbiş-şiə", c. 2, səh. 864, 865.

Xilafət siyasi hakimiyyət olması etibarı ilə ilahi imamətdən tamamilə fərqlidir. İlahi imamət ümmətin seçimi ilə olmur. Çünki ilahi imamət məsumluq və ilmul-kitabdan (kitab elmini bilməkdən) asılıdır. Məsumluq elə gizli işlərdəndir ki, bunu yalnız qəlblərdən agah olan birinin bilməsi mümkündür. Belə olan halda, hikmət sahibi olan Allah imamın seçilməsini imamətin həqiqətindən xəbərdar olmayan ümmətə necə həvalə edə bilər?! Bu, hikmətə müxalif deyilmi? Allah-taala bu vəsfdən münəzzəhdir![124]

İlahi imamətdən imtina etmək olmaz. Çünki bu vəzifə imama Allah tərəfindən verilir. Bu vəzifənin imamdan alınması və ya imamın bu vəzifəni tərk etməsi təsəvvür olunmazdır. İmam evində otursa da, həbsxananın bir küncündə olsa da, yenə də imamdır. Hakimiyyət ilahi hökmləri icra və tətbiq etmək üçün imamın vəzifələrindən biridir. Əgər obyektiv şərait yaranarsa, imamın hakimiyyəti əldə etməsi vacibdir.

Deməli, zahiri  və formal hakimiyyətdən imtina etmək olar. İmam Əli (əleyhissalam) bu növ xilafətin (formal hakimiyyətin) başmağının bağına dəyməyəcək qədər qiymətsiz olduğunu və onun nəzərində keçinin burun suyundan da dəyərsiz olduğunu  buyurur.

Zahiri xilafətin İslamın və müsəlmanların əmin-amanlığı müqabilində heç bir qiyməti yoxdur. İmam Əli (əleyhissalam) buyurur:

**“Toxumları cücərdən və onlara can verənə and olsun ki, əgər ətrafıma toplaşanlar olmasaydı,  yardımçıların olması höccəti tamamlanmasaydı, Allah-təala alimlərdən məzlumun məhrumiyyətinə və zalımın toxluğuna razı olmayın deyə əhd almasaydı, xilafət ipini onun boynuna atar, sonuncusunu birincinin qabı ilə suvarardım.  Sizin can atdığınız bu dünyanın mənim üçün keçinin burun suyundan daha dəyərsiz olduğunu görərdiniz”.**[125]

Dünya kimin nəzərində keçinin burun suyundan dəyərsizdirsə, onun nəzərində xilafət başmağının bağına bərabər deyil. Xüsusilə də ümmət içərisində dünyanını artığı, zinəti, bəzəyi  üçün rəqabət aparanlar olduğu halda dünyadan imtina etməzmi?!

Bu baxımdan da İmam Həsən (əleyhissalam) bu mənsəbdən imtina etməkdə atasından fərqli davranmır. Başqasının nəzərində onun xilafətdən imtina etməsinin hikməti budur. Lakin bu halda belə, ilahi iməməti qoruyub saxlayır. Çünki bu məqamın müsadirə və ya qəsb edilməsi mümkün deyil. Peyğəmbərin (səllallahu

---

[124] Əli Bəhbəhani, “Misbahul-hidayə fi isbatil-vilayə”, səh. 142.
[125] “Şərhu nəhcil-bəlağə”, c. 6, səh. 166.

əleyhi və alihi və səlləm) sözü buna ən gözəl dəlildir: **“Bu iki oğlum hər ikisi qiyam etsələr də, etməsələr də imamdırlar”.**[126]

Həsən (əleyhissalam) və Hüseyn (əleyhissalam) qiyam etsələr də, etməsələr də, xəlifə olsalar da, olmasalar da, imamdırlar.

**Ordunun sayı barədə Qəffarinin səhvi**

Qəffari İmam Həsənin (əleyhissalam) ordusundakı döyüşçülərin sayı barədə danışarkən onun uğrunda öləcək yüz mindən artıq fədainin olduğunu deyir. O, imamın (əleyhissalam) yolunda canından keçəcək yüz min canfədaidən danışır. Lakin bu düzgün məlumat deyil. Çünki ordunun mütəşəkkil olmaması, döyüşçülərin müxtəlif niyyətli olması sülhün bağlanması ilə nəticələndi.

**İmam Həsənin (əleyhissalam) ordusundakı döyüşçülərin sayı**

Döyüşçülərin sayına gəlincə, o, həddindən artıq mübaliğəyə yol verir. Elə rəvayətlərə etimad edir ki, onlar müzakirəyə açıqdırlar. Məhz buna görə də döyüşçülərin sayı barədə araşdırma aparacayıq. Kufə ordusu ilə Şam ordusunun döyüşçülərinin sayı arasında çox böyük fərq vardı. Şam ordusunun döyüşçülərinin sayı altmış minə qədər idi. Kufə ordusunun döyüşçülərinin sayı barəsində isə müxtəlif məlumatlar qeyd olunmuşdu. Həmin məlumatların bir qismini qeyd edirik:

**1. İbn Quteybənin rəvayətinə əsasən yüz min.**

İbn Quteybə deyir: **“Qeyd edirlər ki, İraqda Müaviyəyə beyət olunduqdan sonra Şama döndüyü zaman Süleyman bin Surəd gəlib çıxdı. O Kufədə deyildi. İraq əhalisinin ağalarından və başçılarından idi. O, Həsənin yanına gəlib dedi: “Ey möminləri zəlil edən, salam olsun sənə!” Həsən ona dedi: “Əleykə salam. Səni Allaha and verirəm, əyləş”. Süleyman əyləşdi və dedi: “Sənin Müaviyəyə beyət etməyinə təəccübümüz hələ də bitməyib. Halbuki səninlə İraq əhalisindən yüz min döyüşçü vardı. Bəsrə və Hicaz şiələrindən başqa onların hamısı və özləri qədər də övladları və qulları (beytul-maldan) bəxşiş alırlar”.**[127]

Ordunun döyüşçülərinin sayının yüz min olmasını yalnız İbn Quteybə nəql etmişdi. Qəffari İdn Quteybənin nəql etdiyi rəvayətini dəyərləndirir. Lakin Seyid Murtəza və başqaları Süleyman bin Surədin imamla olan rəvayətini qeyd edərkən, ordunun sayının qırx mindən ibarət olduğunu deyirlər:

---

[126] “əl-İrşad”, c. 2, səh. 30; “İlaluş-şərai”, c. 1, səh. 211; “əl-Fusulul-muxtarə”, səh. 303; “əl-Mənaqib”, c. 3, səh. 136.

[127] “əl-İmamə vəs-siyasə”, c. 1, səh, 141.

**“Həsən (əleyhissalam) Müaviyəyə beyət etdikdən sonra şiələr döyüşü tərk etdikləri üçün təəssüf hissi keçirirdilər. Müaviyəyə beyət olunduqdan iki il sonra Süleyman bin Surəd əl-Xuzai İmama dedi: “Sənin Müaviyəyə beyət etməyinə təəccübümüz hələ də bitməyib. Halbuki səninlə İraq əhalisindən qırx min döyüşçü vardı. Bəsrə və Hicaz şiələrindən başqa onların hamısı və özləri qədər də övladları və qulları (beytul-maldan) bəxşiş alırlar”.**[128]

Bundan əlavə, Süleyman Kufədə deyildi. Baş verən xəyanətdən xəbərdar deyildi. O, vəziyyəti İmam Əlinin (əleyhissalam) Siffində olduğu kimi təsəvvür edirdi. Belə ki, həmin zaman on minlərlə Kufə əhalisi İmamın ətrafında cəm olmuşdu. Buna əsasən də ordudakı döyüşçülərin sayını bilmək üçün  Süleymanın sözünə etimad etmək olmaz.[129]

**2. Yəqubinin rəvayəti (doxsan min nəfər)**

Bu sayı Ziyad bin Əbih Müaviyənin onu hədələdiyi məktuba cavab olaraq demişdi: **“Ciyər yeyənin oğlu, nifaq ocağı Əhzab (döyüşündəki müşriklərin) qalığı məktub yazıb məni hədələyir. Onunla mənim aramda Peyğəmbərin iki övladı çənələrini qılınclarına söykəmiş doxsan min nəfərlik (digər rəvayətdə yetmiş min)[130] ordu ilə gözləyir....”**[131]

Nəql edən Ziyad bin Əbih olduğu üçün bu rəqəmə etibar etmək olmaz.

Bu rəqəmə də əsaslanmaq olmaz. Çünki Ziyad həmin hadisələrin baş verdiyi vaxt uzaqda idi. Beləki o, Farsda (İran) vali idi.[132] Buna görə də onun xəbəri birbaşa müşahidə yolu ilə deyil, təxminə əsaslanır.

**3. İbn Əsakir və İbn Kəsirin rəvayəti (yetmiş və ya səksən min nəfər)**

İbn Əsakir və İbn Kəsir belə nəql edirlər (Mətn birinciyə məxsusdur) : **“Bir nəfər Mədinədə Həsənin yanına gəldi. Onun əlində bir səhifə vardı. Həmin adam dedi: “Bu nədir?” O dedi: “Müaviyədəndir. Bu məktubda vəd verir və hədələyir”. Həmin adam dedi: “Sən onunla insafla davranmısan axı”. (İmam) dedi: “Bəli. Mən qorxurdum ki, qiyamət günü yetmiş və ya səksən min, az və ya daha çox insan damarlarından qan axan halda Allahdan onların qanını axıdan şəxsdən qisas almasını istəyərlər”.**[133]

---

[128] Şərif Murtəza, “Tənzihul-ənbiyə”, səh. 223. Həmçinin bax: “Mənaqibu Ali Əbu Talib”, c. 3, səh. 197; “Biharul-ənvar”, c. 44, səh. 29. Bu mənbələrin hamısında qırx min nəfər qeyd olunur.

[129] Şeyx Razi Ali Yasin, “Sulhul-Həsən”, səh. 119.

[130] “əl-Kamil fit-tarix”,  c. 3, səh. 322.

[131] “Tarixu Yəqubi”, c. 2, səh. 218.

[132] Xeyrəddin Zərkəli, “əl-Əlam”, c.8, səh. 53.

[133] “Tarixu mədinəti Diməşq”, c. 13, səh. 281; “əl-Bidayə vən-nihayə”, c. 8, səh. 46.

Bu rəvayətə əsasən, İmam Həsən (əleyhissalam) Şam ordusu ilə Kufə ordusunun döyüşçülərinin sayının birlikdə yetmiş və ya səksən min arasında olduğunu bildirir. Çünki hamısı qanının tökülməsinin qisasını tələb edir. Bilirik ki, Şam ordusu altmış min döyüşçüdən ibarət idi. Bu halda ən böyük təxminə əsasən, Kufə ordusu iyirmi mindən az deyil. İmamın tərəddüt edərək döyüşçülərin sayını deməsi buna dəlildir. Əgər yalnız öz döyüşçülərinin sayını desəydi tərəddüt etməzdi. Çünki Şam ordusuna nisbətdə öz ordusunun döyüşçülərinin sayını daha yaxşı bilirdi.

**4. Təbəri, İbn Əsir və İbn Əbilhədidin rəvayəti (qırx min)**

Təbəri Zühridən belə nəql edir: **"Müaviyə Abdullah bin Abbasdan və Həsəndən qurtulduqdan sonra elə bir əhəmiyyətli adama hiylə hazırlamağa başladı ki, həmin adamın yanında qırx min nəfər var idi"**.[134]

İbn Əsir deyir: **"Əmirəlmöminin Əli Şam əhlinin onlara hücum edəcəklərini xəbər verdikdə onun ordusundan qırx min nəfər ona uğrunda öləcəkləri şərti ilə beyət etmişdilər. Lakin o, hərəkətə başlamaq istəyərkən qətlə yetirildi. Allah bir şeyi istəyərsə, heç nə onun qarşısını ala bilməz. O, qətlə yetirildikdən sonra insanlar onun oğlu Həsənə beyət etdilər. Ona Müaviyənin Şam ordusu ilə üzərlərinə gəlməsi xəbəri çatdı. Əliyə beyət edən ordunu hazırlayaraq Kufədən çıxıb Müaviyəni qarşılamağa getdi".**[135]

İbn Əbulhədid Müsəyyib bin Nəciyyənin İmam Həsənə (əleyhissalam) belə dediyini nəql edir: **"İndiyədək sənə təəccüb edirəm. Qırx min nəfər döyüşçün olduğu halda Müaviyəyə beyət etdin?!"**[136]

Lakin iki səbəbə görə bu rəqəm də etibarlı məlumat deyil.

**Birinci:** Bu rəqəmi qeyd edənlər xəyanət nəticəsində ordunun əksər döyüşçülərinin Müaviyənin ordusuna qoşulması hadisəsindən xəbərsizdir. Belə ki, Übeydullah bin Abbasla birgə səkkiz min nəfər qaçdı.[137] Kində qəbiləsindən olan ordu başçıları ilə birgə 200-ə qədər silahdaşı qaçdı.[138] Çox güman ki, qırx min rəqəmi Əmirəlmöminin Əlinin (əleyhissalam) şəhid olmasından öncə onun ətrafında cəm olan ordu idi. Necə ki, İbn Əsirin yazdığı buna işarə edir.

Təbərinin Zühridən nəql etdiyinə gəlincə, Übeydullah bin Abbasın qaçmasından sonra Qeys bin Sədin yanında qırx min döyüşçünün qalmasını hesab

---

[134] "Tarixu Təbəri", c. 4, səh. 125.
[135] "əl-Kamil fit-tarix", c. 3, səh. 404.
[136] İbn Əbilhədid, "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 15.
[137] "Tarixu Yəqubi", c. 2, səh. 214.
[138] "Biharul-ənvar", c. 44, səh. 44.

etmək rəvayətlərə ziddir. Həmin rəvayətlərə əsasən isə İmam Həsən (əleyhissalam) Übeydullah bin Abbasla 12 min nəfər göndərmişdi. Onun qaçmasından sonra orduya başçı olan Qeys bin Sədin yanında qırx min deyil, dörd min döyüşçü vardı.

**İkinci:** Həmçinin, İmam Həsənin (əleyhissalam) yuxarıda döyüşçülərin sayı ilə bağlı dediyi ilə uyğun gəlmir. İmamın dediklərinə əsasən döyüşçülərin sayı 20 min nəfərdən çox olmamışdı.

**Etibar ediləcək say**

Ordunun döyüşçülərinin sayı barəsində ən dəqiq say ən çoxu iyirmi min nəfərdən ibarət olmasıdır. Bunu İmam Həsənin yuxarıda dediyi sözdən də başa düşürük. Hər bir halda Qəffarinin ordunun sayının yüz min nəfərdən ibarət olması barədə dediyi söz həqiqətdən uzaqdır və düzgün deyil.[139]

**Sülh barədə rəvayətin izahı (Bəlkə də Allah onun vasitəsilə...)**

Qəffarinin dəlil gətirdiyi rəvayətə əsasən, İmam Həsənin (əleyhissalam) xilafətdən imtina etməsi və ya sülh bağlamasının daha yaxşı olmasına gəlincə, həmin rəvayətdə deyilir: **"Mənim bu oğlum ağadır. Bəlkə də Allah-taala onun vasitəsilə müsəlman olan iki böyük dəstə arasında sülh elədi".**

**Cavab:**

**1. Bu rəvayət şiə mənbələrində sübut olunmamışdır.**

Buna əsasən də bir şey isbat etmək üçün ona etibar etmək olmaz.

**2. Bu rəvayət əhəd rəvayətdir.**

Şeyx Həsən bin Fərhan əl-Maliki bu hədislə "Əmmarı yolunu azmış dəstə qətlə yetirəcək" rəvayəti arasında müqayisə apararaq belə deyir: **"Çox zaman "Bu oğlum ağadır. Allah onun vasitəsilə müsəlman olan iki dəstə arasında sülh edəcək..." rəvayətini təkrar-təkrar deyirlər, lakin "Əmmarı yolunu azmış dəstə qətlə yetirəcək" hədisini unudurlar. Baxmayaraq ki, Darəqutninin "əl-İləl" kitabında nəql etdiyi kimi, Həsənin sülhü hədisi əhəddir, sənədi**

[139] Ordudakı döyüşçülərin sayı barədə daha geniş məlumatlar əldə etmək istəyənlər Şeyx Razi Ali Yasinin "Sulhul-Həsən" kitabına səh. 11 və sonrakı səhifələrə baxa bilər.

**ixtilaflıdır. Halbuki, Əmmar barəsindəki hədis mütəvatir və səhihliyi qəbul olunmuşdur”.**[140]

Onun rəyinə əsasən sülh hədisi ahad olduğu üçün ona əsaslanmaq və etimad etmək olmaz.

**3. Rəvayət gələcək barədə xəbər verir. Ehtimala dəlalət edir.**

Bu rəvayət yalnız gələcəkdə baş verəcək sülh haqqında əvvəlcədən verilən xəbərə dəlalət edir. Başqa sözlə desək, öncədəngörmədir. Burada sülhün üstün və daha yaxşı olmasına heç bir dəlalət yoxdur. Burada “ləllə” ön qoşması üstünlüyə və ya arzuya dəlalət etmir, əksinə ehtimala və gümana dəlalət edir.

**4. Rəvayətdə sülhün üstün olmasına aid heç bir dəlil yoxdur.**

Rəvayətin sülhün üstün əməl olmasına dəlalət etdiyini qəbul etsək də, bu, sülhün özlüyündə və hər bir şəraitdə üstün əməl olmasında dəlalət etmir. İmam Həsən (əleyhissalam)  heç bir rəqibi olmayan imamdır. Mühacir və ənsarlar məhz ona beyət etmişdilər. O, ən doğru əməli bilir. Sülhün üstünlüyü o zaman olur ki, nəzərdə tutulan məqsəd həyata keçsin. Əgər sülh tərk olunardısa, həmin təcavüzkar zalım güc vasitəsilə hakimiyyətə gələcək və şəri imamın sağ qalan yardımçılarının qanlarını tökəcək, imamın həyatını təhlükəyə məruz qoyacaqdı. Bununla da haqq itəcək və hədər yerə qan töküləcəkdi.

Deməli, yalnız yardım edəcək insanlar olmadıqda və döyüşmək haqqın aradan getməsinə səbəb olacağı halda rəvayətin sülhün üstün olmasına dəlalət etdiyini deyə bilərik.

**5. Rəvayətdə iki müsəlman dəstə deyilməsinin Müaviyənin dəstəsinə heç bir faydası yoxdur. Bu, onu təcavüzkar dəstədən çıxarıb haqqlı dəstəyə çevirmir.**

Bəli, zahirdə həmin dəstə müsəlman dəstədir. Lakin Əmmarı qətlə yetirdikdən, zəmanəsinin imamı Əmirəlmöminin Əli (əleyhissalam) və İmam Həsənə (əleyhissalam) qarşı çıxdıqdan sonra etdikləri günahlardan tövbə etməyərək öz azğınlıqlarını davam etdirdikləri üçün azğınlıq bu dəstənin ayrılmaz xüsusiyyəti olmuşdur. Böyük ehtimala əsasən, vəziyyət sakitləşdikdən sonra bu dəstə öz hərəkətlərinə, azğınlıqlarına haqq qazandırmaq üçün bu hədisi qondarmışlar.

Yuxarıda qeyd edilən şübhə zəifdir. Bu hədisdə İmam Həsənin (əleyhissalam) Müaviyənin xeyirinə xəlifəlikdən imtina etməsinə heç nə dəlalət

[140] “Qiraətun fi kutubi əqaid”, səh. 74.

etmir. İmam ona heç bir qanunilik verməmişdir. Əksinə, sülh sazişi Müaviyənin İslam dininə bəslədiyi kin-küdurəti üzə çıxardı. İmam bu insanın həqiqi sifətini üzə çıxardı və onun İslamı təmsil etmədiyini bəyan etdi. İmam Həsən (əleyhissalam) ona xitab edərək belə demişdi: **“Bu gün, ey Müaviyə, kimsə təəccüb edəcəksə, sənin nə dində bəlli fəzilətin, nə də İslamda tərifəlayiq izin olmadan layiq olmadığın məqama can atmağına təəccüblənməlidir. Sən (İslama qarşı vuruşan) dəstədən olan birinin, Peyğəmbərə (səllallahu əleyhi və alihi və səlləm) ən qatı düşmən olan qureyşlinin övladısan. Lakin Allah səni xar edəcək. Axirət yurdunun kimə məxsus olacağını biləcəksən. Allaha and olsun, ən yaxın vaxtda Rəbbinlə qarşılaşacaqsan. Sonra elədiklərinə görə sənə cəza verəcək. Allah bəndələrinə heç vaxt zülm etməz”.**[141]

### İkinci şübhə:

### İmam Həsən çox evlənib çox boşanandır.

Dillərdə gəzən şübhələrdən bir də İmam Həsənin hərb və cihaddan çox rifah və əyləncəyə meyilli olması şübhəsidir. Güya buna görə də İslamın mənfəətlərini düşünmədən sülh bağlamışdı. Bu şübhəni deyənlər hər iki məzhəbin kitablarında qeyd olunan bəzi rəvayətlərə etimad edirlər. Halbuki həmin rəvayətlər araşdırılmalı və tədqiq edilməlidir.

### Tarix və hədis kitablarında qeyd olunan rəvayətlər:

Tarixçilər və mühəddislər İmam Həsənin (əleyhissalam) zövcələri barədə olduqca çox danışaraq mübaliğəyə yol vermişlər. Belə ki, onların dediklərinə əsasən imamın zövcələrinin sayı 50, 60, bəzilərinə görə isə 70 qadın olmuşdur.

### 1. Mədaininin nəql etdiyi rəvayət

Mədaini[142] deyir: **“Həsən bin Əlinin zövcələrinin sayı araşdırılmış və yetmiş qadın olduğu məlum olmuşdur”.**[143]

Həmçinin belə rəvayət edir: **“O, bir kişinin qızını istədi və həmin kişi qızını onunla evləndirdi. Sonra dedi: “Mən bilirəm ki, sən zəif iradəli, çox**

---

[141] İbn Əbilhədid, “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 34.

[142] Mədaininin tərcümeyi-halında İbn Həsər deyir: *“Muhəmməd Əbul Həsən Mədaini əl-Əxbari. Əbdürrəhman bin Sumrənin nökəri olub. İbn Udəy onu barəsində deyib: “Əli bin Muhəmməd bin Abdullah bin Əbu Seyf əl-Mədaini. Hədisdə güclü deyil. “əl-Əxbar” kitabının müəllifidir. Onun sənədli rəvayətləri çox azdır”.* (Lisanul-mizan, c. 4, səh. 253.) Bu adamın nəql etdiyi hədislər güclü deyil. Həmçinin o, Əli ailəsinə düşmənçilik bəsləməkdə məşhur olan Əbdürrəhman bin Sumrə əl-Əməvinin nökəri olub.

[143] “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 22.

**qadın boşayan və qaraqabaqsan. Lakin sən nəsəb baxımından insanların ən xeyirlisi, baba və ata baxımından ən yüksəkdə olanısan”.**[144]

İbn Əbilhədid bu sözə haşiyə çıxaraq deyir: **“Onun zəif iradəli və çox qadın boşayan sözünə gəlincə, doğru deyir. Amma qaraqabaq deməsi doğru deyil. Çünki çox qaraqabaq olmaq bəyənilmir”.**[145]

Burada İbn Əbilhədid İmam Həsənin çox talaq verən olması barədə Mədaininin dediyini təsdiqləyir, lakin onun qaraqabaq olmasına etiraz edir.

**2. İbn Kəsirin rəvayəti**

İbn Kəsir deyir: **“Deyirlər ki, o, çox evlənən biri olub. Heç vaxt yanında dörddən az qadını olmayıb. Tez-tez qadın boşayan və mehriyə verən idi. Deyilənə görə, onun 70 qadını olub. Həmçinin, onun bir gündə iki qadın boşadığını deyirlər...”**[146]

Bəlkə də İbn Kəsir bu sayı deyərkən heç bir araşdırma aparmadan Mədainiyə etimad etmişdir.

**3. Əbu Talib Məkkinin[147] rəvayəti**

Bu say 200, 250 hətta 300-ə qədər yüksəlmişdi. Belə ki, Əbu Talib Məkki “Qutul-qulub” kitabında yazır: **“Həsən bin Əli (Allah ondan razı olsun) 250 qadınla evlənmişdi. Deyilənə görə, 300 olub. Əli (əleyhissalam) onun bu hərəkətindən narahat olardı, onları boşadıqda həya edərdi və belə deyərdi: “Həsən çox qadın boşayandır. Ona qız verməyin...”**[148]

**4. Kuleyninin və Bərqinin nəql etdiyi rəvayət**

Şeyx Kuleyni[149] “əl-Kafi” kitabında[150], həmçinin əl-Bərqi “əl-Məhasin”[151] kitabında bu rəvayətlərin bəzilərini qeyd etmişlər.

---

[144] “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 21.
[145] “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 21
[146] İbn Kəsir Diməşqi, “əl-Bidayə vən-nihayə”, c. 8, səh. 42.
[147] Xətib Bağdadi onun tərcümeyi-halında belə deyir: *“Muhəmməd bin Ətiyyə Əbu Talib. Məkki nisbəti ilə tanınmışdı. Sufi yönümlü “Qutul-qulub” adlı bir kitab təlif etmişdi. Həmin kitabda qəbuledilməz və ürəkbulandıran xüsusiyyətlər qeyd etmişdir... Bağdada gəlmiş və insanlar moizə üçün onun başına toplaşmışlar. Sözləri qarışıq olmuşdur. Onun belə dediyi nəql olunur: “Məxlaqlara xaliq qədər zərər verən biri yoxdur”. İnsanlar onu bidət əhli sayıb tərk etmişlər.”* (Tarixu Bağdad, c. 3, səh. 303.)
Səlahuddin əs-Səfədi nəql edir: *“İbn Covzi “əl-Mirat” kitabında deyir: “Qutul-qulub kitabında kökü olmayan hədislər nəql edilmişdir”.* (əl-Vafi bil-vəfiyyat, c. 4, səh. 87.)
Belə məlum olur ki, bu adam hədis alimlərinin nəzərində etimad olunan deyil. Çünki qarışıq sözlər demiş və bidət etmişdir. O, mənbəsi olmayan hədislər nəql etmişdir.
[148] Əbu Talib əl-Məkki, “Qutul-qulub”, c. 2, səh. 408.
[149] Kuleyninin, Bərqinin və başqalarının nəql etdiyi rəvayətlərə gəlincə, onların məzmununu araşdıracağıq. Belə rəvayətlər Qurani-kərim, səhihliyi qəti surətdə sübut olunmuş hədis və ağıl kimi hədis və rəvayətlərin səhihliyini göstərən meyarlardan xali olduğu üçün onları qəbul edə bilmərik.

**Şübhənin cavabı:**

**Rəvayətlərin qəbul olunmasının meyar və qaydaları**

Bu rəvayətlərinin sənədləri və say çoxluğuna baxmayaraq, onların qəbul olunması üçün məzmunlarını tədqiq etmək vacibdir. Həmçinin, bu rəvayətlərin doğru və ya yalan olmasında əhəmiyyətli rol oynayan meyarlar vardır ki, sünni və şiə məzhəbləri həmin meyarlar barədə eyni rəydədirlər. Rəvayətin sənədinin səhih olması onun məzmununun doğru olması zərurətini yaratmır. Həmin meyarların ən əhəmiyyətli olanları aşağıdakılardır:

**1. Qurani-kərimə zidd olmamalıdır.**

**2. Səhihliyi sübuta yetmiş peyğəmbər sünnəsinə müxalif olmamalıdır.**

**3. Əqli qanunlara zidd olmamalıdır.**

**4. Tarixi cəhətdən sübut olmuş həqiqətlərə zidd olmamalıdır.**

**5. Reallığa zidd olmamalıdır.**

**6. Məzhəbin zəruri prinsiplərinə zidd olmamalıdır.**

Hər iki məzhəbin alimlərinin sözlərindən sitat gətirərkən qeyd edəcəyimiz digər meyarlar da vardır.

Deməli, bəzi rəvayətlərin sənədinin səhih olmasını fərz etsək də, onların yuxarıda qeyd etdiyimiz meyarlara zidd olması ilə qarşılaşa bilərik.

**1. Şeyx Mufid**

Şeyx Mufid deyir: **“Qurana müxalif olan hədislə qarşılaşarıqsa və heç bir halda kitaba müvafiq olması mümkün deyilsə, həmin hədisi atmalıyıq. Çünki Quran buna hökm edir və İmamlar (əleyhissalam) bu barədə icma ediblər. Həmçinin, ağıl qanunlarına müxalif olarsa, ağlın hökmünə əsasən onu atmalıyıq”.**[152]

Deməli, Qurana müxalif olan, onun məfhumları ilə uyğun olmayan hər bir hədisi atmaq vacibdir. Həmçinin, rəvayətlər ağıl baxımından dəyərləndirilməlidir. Ağıla müxalif olan hər bir hədisi atmaq vacibdir.

**2. Şeyx Tusi**

---

[150] “əl-Kafi”, c. 6, səh. 56. Həmçinin, əhli-sünnə alimlərindən İbn Əbu Şeybə də bu rəvayəti nəql etmişdir c. 4, səh. 172; “Tarixu mədinəti Diməşq”, c. 13, səh. 249.
[151] Bərqi, “əl-Məhasin”, c.2, səh. 601.
[152] Şeyx Mufid, “Təshihu itiqadatil-imamiyyə”, səh. 149.

Şeyx Tusi deyir: **“Əgər bu hədis öz məzmununda Quran, sünnə və ya icmaya müxalif olarsa, onu atmaq və dəlilin göstərişinə əsasən əməl etmək vacibdir”.**[153]

Şeyx Tusinin nəzərində hədisin məzmununun qəbul olunmasınının qaydası onun Quran, sünnə və icmaya müvafiq olmasıdır.

**3. Əllamə Tustəri**

Alimlərimizin qeyd etdiyi digər meyarlar da var. Əllamə Tustəri həmin meyarlardan bəzilərini qeyd etmişdir. Bu meyarlar onun “əl-Əxbar əd-Dəxilə” kitabında pərakəndə şəkildə qeyd olunmuşdur. Onların bəzilərini aşağıda qeyd edirik:

1. Hədisin Quranla müqayisə olunması.[154]

2. Səhihliyi sübut olunmuş hədislə müqayisə olunması.[155]

3. Hədisin ağıl və məntiqə uyğun olması.[156]

4. Hədisin reallığa uyğun olması.[157]

5. Hədisin İmamların ədəb və şəninə uyğun olması.[158]

6. Məzhəbin zəruri prinsiplərinə müxalif olmaması.[159]

**4. Əllamə Muhəmməd Hüseyn Təbatəbai**

Seyid Təbatəbai bəzi kitablarında dəfələrlə bir meyarı qeyd edir. Həmin meyar hədisləri Qurani-kərimlə müqayisə etməkdir. O, belə deyir:

**“Hədisin Quran tərəfindən təstiqləməsinə ehtiyacı var. Buna əsasən də Peyğəmbərin (səlləllahu aleyhi və alihi vəsəlləm) və əhli-beytinin buyurduğu kimi, hədisi Qurana təqdim etmək lazımdır. Əgər hər hansı bir ayənin nazil olma səbəbi barədə deyilən hədis mütəvatir və ya səhihliyi sübut olmazsa, həmin hədisi Quranla tutuşdurmaq lazımdır. Məzmunu ayənin məzmununa müvafiq olan hədisə etimad etmək və ona əməl etmək olar. Bu metoda əsasən, nazil olma səbəbi barədə olan bir çox hədislər etibardan düşür”.**[160]

---

[153] Şeyx Tusi, “İddətul-usul”, c. 1, səh. 145.
[154] Əllamə Tustəri, “əl-Əxbar əd-Dəxilə”, c. 3, səh. 313-314, 316.
[155] Həmin mənbə, səh. 116, 147-148.
[156] Həmin mənbə, səh. 148, 236.
[157] Həmin mənbə, c. 1, səh. 250, c. 4, səh. 307.
[158] Həmin mənbə, c. 1, səh. 99 və c. 2, səh. 305.
[159] Həmin mənbə, c. 1, səh. 108.
[160] Muhəmməd Hüseyn Təbətəbai, “əl-Quran fil-İslam”, səh. 125, 126.

Həmçinin deyir: **“Bu metod, yəni hədisi Quranla müqayisə etmək günümüzədək ümmətin içərisində sözdə əməl edilməsinə baxmayaraq əməli baxımdan tərk edilməkdədir. Peyğəmbər buyurdu: “Ey Rəbbim, qövmüm bu Quranı tərk etdi”. Əhəd hədislərə də əməl etmişlər. Məhz bu güzəşt, İslam millətləri arasında İslam dinini qəbul etmələrindən sonra da xurafatların qalmasına səbəb olmuşdur. Dərd özü ilə dərd gətirər”.**[161]

Seyid Təbətəbai bu sözləri ilə bu sahədəki güzəştdən şikayət edir. Onu xəstəlik adlandırır. Bunun əsas səbəbini Qurani-kərimi tərk etməkdə və Quranın mənalarının həqiqi məfhumundan uzaq düşməkdə görür. Halbuki, Qurandan başqa hər bir şey Quranla tutuşdurulmalıdır.

Həmçinin, əhli-sünnə alimləri də hədisin məzmunu dəyərləndirərkən bu metodu qeyd edirlər.

**5. Xətib Bağdadi**

Xətib Bağdadi deyir: **“Vahid hədis ağlın, Quranın möhkəm ayəsinin, (səhihliyi) məlum olan sünnənin, sünnə məqamında olan əməlin və hər bir qəti dəlilin hökmünə zidd olarsa, qəbul olunmaz”.**[162]

Göründüyü kimi, Xətib Bağdadi hədisi ağıl, Quranın hökmü, sünnə və qəti dəlillə müqayisə edir. Əgər hədis bu meyarlara müxalif olarsa, sənədinin düzgünlüyünə baxmayaraq etibardan düşər.

**6. İbn Səlah**

İbn Səlah deyir: **“Səhih hədisin şərti təkcə onun sənəd baxımından düzgün olması deyil. Çünki elə səhih hədis var ki, bir nəfər ədalətli şəxs onu nəql etib. Həmçinin, səhih hədis ümmətin qəbul edilməsi üçün icma etdiyi hədis də deyil. Əgər “bu hədis səhih deyil” deyərlərsə, bu o demək deyil ki, həmin hədis yalan hədisdi. Ola bilsin ki, özlüyündə səhih hədis olsun. Belə deyilməsində məqsəd yalnız onun sənədinin qeyd olunan şərtə müvafiq olmamasıdır”.**[163]

**7. Cəssas**

Cəssas deyir: **“Əhəd hədislərin qəbul olunmamasının şərtlərindən biri də onun ağlın hökmlərinə zidd olmasıdır. Çünki ağıl Allahın höccətidir. Onun**

---

[161] Muhəmməd Hüseyn Təbətəbai, “əl-Mizan fi təfsiril-Quran”, c. 5. Səh. 274.
[162] Xətib Bağdadi, “əl-Kifayə fi elmid-dirayə”, səh. 472.
[163] İbn Salah, “Müqəddimətu İbn Salah”, səh. 17.

**dələlət  və vacib etdiyinə qarşı çıxmaq yolverilməzdir. Ağılın hökmünə zidd olan hər bir hədis batildir və qəbuledilməzdir”.**[164]

**8. İbn Qəyyim əl-Covziyyə**

İbn Qəyyim əl-Covziyyə bu məsələni bir az müfəssəl şəkildə izah etmişdir.

O, “əl-Mənarul-munif fi səhihi vəz-zəif” kitabında hədisin məzmununu geniş şəkildə tənqid etmişdir. Onun bu mövzuda sadaladığı meyarlardan bəziləri bunlardır: **“Hədisin Quranın aşkar hökmünə müxalif olması, Rəsulullahın (səlləllahu aleyhi və alihi və səlləm)  qəbul etməyəcəyi cəfəngiyyatları ehtiva etməsi, səhihliyi sübut olunmuş sünnənin aşkar hökmlərinə zidd olması, hədisin özlüyündə batil olması, hədisin məzmununda onun batil olmasına dəlalət edən əlamətlərin olması və s.”.**[165]

Deməli, hədisin sənədinin səhih olması heç də onun məzmununun səhih olması anlamında deyil. Burada meyar həmişə hədis nəql edənlər deyil. Ravilər ədalət şərtinə sahib olsalar da, onlar məsum deyildirlər. Hədis tənqidçisi olan alimlər onları etibarlı, inanılmış kimi xüsusiyyətlərlə vəsf etsələr də, onların xəta, səhv və anlaşılmazlığa yol vermələri mümkündür.

**İmam Həsənin (əleyhissalam) evlənib talaq verməsi barədə nəql olunan hədislərin qeyd edilən meyarlar əsasında dəyərləndirilməsi.**

Bizim yuxarıda qeyd etdiyimiz meyarlar əsasında rəvayətləri dəyərləndirməyə haqqımız var.

**1. İmamın məsum olması bu saya uyğun deyil.**

Rəvayətlərdə İmamın evləndiyi və boşadığı qadınların çox sayda qeyd edilməsi İmamın Qurani-kərimdə buyurulan məsumluğu ilə ziddiyyət yaradır. Çünki İmam Həsən məsumluğa dəlalət edən “təthir ayəsinin” şamil olduğu əhli-beytdəndir. Allah-təala buyurur: **“Allah (xüsusi yaradılış iradəsi ilə) siz (Peyğəmbərin) Əhli-beytindən  (əqidə, əxlaq və əməllərdə) hər cür pisliyi təmizləmək və sizi paklığın bütün cəhətlərindən – pak etmək istəyir”.** (Əhzab surəsi, ayə 33).

Hədislər məhz onların Allah tərəfindən pak edilmələrini və hər cür pisliklərin onlardan uzaqlaşdırılmasını bildirir. Müslim öz “Səhih”ində yazır:

Səfiyyə binti Şeybə Aişənin belə dediyini nəql edir: **“Bir gün Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) əynində qara dəridən hazırlanmış**

[164] Cəssas, “əl-Fusul fil-usul”, cəh. 121, 122.
[165] İbn Qəyyim Covziyyə, “əl-Mənarul-munif fi səhihi vəz-zəif”, c. 1, səh. 50.

**(Yəmən) əbasında (evindən) çıxdı. Həsən bin Əli (onun yanına) gəldi. (Peyğəmbər) onu öz əbasının altına aldı. Sonra Hüseyn gəlib onun yanına daxil oldu. Daha sonra Fatimə gəldi. (Peyğəmbər) onu da öz əbasının altına aldı. Bundan sonra Əli gəldi. Peyğəmbər onu da əbasının altına alıb belə buyurdu: "Siz, ey əhli-beyt! Allah yalnız sizdən çirkinliyi yox etmək və sizi pak etmək istər!"**[166]

Təbii ki, məsum olan şəxs belə bir iş tutmaz. Belə ki, 50 və ya 300 qadını boşamaq İmamın nəzərində günah hesab olunur.

Biz bu rəvayətlərin məzmununa etibar edə bilmərik. Bu rəvayətlər İmamı hörmətdən salır. Bəlkə də adi insan belə bir iş tutarsa, cəmiyyətin qınaq obyektinə çevrilər. Bəs məsum şəxs belə edərsə necə olar?!

Bəlkə də, kimlərsə bu ayəyə əsasən əhli-beytin məsumluğunun isbatına irad tuta bilər. Onlara cavab olaraq deyirk:

Bu ayədə əhli-beytin məsumluğuna dəlil yalnız onlardan pisliklərin, yəni günahların uzaqlaşdırılmasına dəlalət edən "innəmə" həsr ədadıtır. Bu ədat qəti həsr ədatıdır. Allahın iradə etdiyi bir şeyin Onun iradəsindən kənar qalmasınının qeyri-mümkünlüyü Allaha iman gətirən hər bir kəs üçün aşkar bir məsələdir. Allahın kitabında oxuyuruq: **"Bir şeyin olmasını istədiyi zaman Onun (Allahın) əmri və məqamı: "Ol!" - deməkdir. O da dərhal olar".** (Yasin surəsi, ayə 82). Allahın iradəsinin hər bir mövcudun tam səbəbi olmasını dərk edən şəxs üçün də fəlsəfi baxımdan bu məsələ aydındır. Çünki nəticənin səbəbdən ayrı olmasının qeyri-mümkünlüyü bədihi (açıq-aşkar) məsələlərdəndir. Məsumluq dedikdə, məsumluğa sahib olan insandan günah əməl baş verməsinin qeyri-mümkün olması mənası başa düşülür. (Yəni, Allah-təalanın onlardan hər növ pisliklərin uzaq olmasını istəməsi onlardan günah əməl baş verməsinin qeyri-mümkün olduğunu bildirir)".[167]

Bu rəvayət Qurani-kərim və məsumların kimiliyini bəyan edən səhihliyi qəti sübut olunmuş sünnə ilə ziddiyyət yaradır. Çünki hər iki məzhəbin mənbələrində onların fəzilətləri, əzəmətləri və üstünlükləri barədə olduqca çoxlu hədis və rəvayətlər nəql olunmuşdur. Misal olaraq, *"Onların hər ikisi cənnət cavanlarının ağasıdır", "Onlar hər ikisi qiyam etsələr də, etməsələr də, imamdırlar", "Onlar insanlar içərisində əxlaq və zahiri yaradılışda Peyğəmbərə ən çox bənzəyənlərdi"* və s. Əvvəlki bəhslərdə İmam Həsənin (əleyhissalam) fəzilətləri barədə söhbət açmışdıq.

---

[166] "Səhih Müslim", c. 7, səh. 130.
[167] Muhəmməd Təqi əl-Həkim, "əl-Usulul-ammə lilfiqhil-muqarin", səh. 149.

**2. İmam Həsənin (əleyhissalam) düşməni Müaviyə onunla mübahisələrində bu məsələ barədə söhbət açmamışdır**

Diqqət etməli olduğumuz vacib məsələlərdən biri də budur ki, İmam Əlinin (əleyhissalam) qatı düşməni olan Müaviyə şübhə və fitnə yaratmaqla, suyu bulandırıb balıq tutmaqla məşğul olduğu halda İmam Həsənə (əleyhissalam) evlilik və boşanmanın çoxluğu barədə tənə vurmamışdır. Bu, ona dəlalət edir ki, qeyd olunan iddia iftira və batildir. Bəlkə də İmam Həsənin (əleyhissalam) vəfatından sonra Abbasi xəlifələri dövründə uydurulmuşdur.

**3. Tarix və tərcümeyi-hal kitablarında bu qədər çox sayda evlilik və boşanmadan bəhs edilməmişdir.**

Əgər tarix, tərcümeyi-hal və ənsab kitablarını araşdırsaq zövcələrin sayını göstərən və adlarını qeyd edən bu kitablarda şişirdilmiş əlli və yüzlərlə olan bu say öz əksini tapmır. Bir çox tarixçilər İmam Həsənin (əleyhissalam) adları aşağıda çəkilən qadınlarla evləndiyini qeyd etmişlər:

1. Xaulə binti Mənzur bin Zəban Fəzariyə. Onun anasını adı Məlikə binti Xaricə bin Sinan idi.

2. Ümmü İshaq binti Təlhə bin Übeydullah. O, bir uşaq dünyaya gətirdi. İmam onun adını Təlhə qoymuşdu.

3. Ümmü Bişr binti Əbu Məsud Ənsari. O, Zeyd bin Həsəni dünyaya gətirmişdi.

4. Cədə binti Əşəs bin Qeys. Bu qadın İmamı zəhərləmişdi.

5. Hind binti Suheyl bin Əmr.

6. Həfsə binti Əbdürrəhman bin Əbu Bəkr.

7. Kəlb qəbiləsindən olan bir qadın.

8. Əmr bin Əlqəmə bin Əhtəm Minqəri tayfasından bir qadın.

9. Səqif qəbiləsindən bir qadınla evlənmişdi. Həmin qadın ona Ömər adlı bir uşaq dünyaya gətirmişdi.

10. Əlqəmə bin Zürarə tayfasından bir qadın.

11. Bəni Şeyban tayfasından bir qadın.

12. Ali Həmam bin Murrə tayfasından bir qadın.[168]

Bu say 12-dən artıq deyil. O zamanın ürfünə görə bu sayda zövcələrin olması heç də eyib tutulacaq nöqsanlı əməl deyildi. Əgər ravilərin və tarixçilərin qeyd etdikləri 200 və ya 300 zövcənin olmasını fərz etsək, İmamın övladlarının sayı daha çox olardı.

Bundan əlavə, ürf çox boşanmanı nöqsanlı hesab edir. Çünki bu, insanlar arasında kin-küdurət və mübahisələr yaradır. Halbuki tarixdə belə bir halın olması öz əksini tapmamışdı. Belə hadisə olmadığı üçün tarix onun barədə söhbət açmamışdı.

**4. İmam Həsənin (əleyhissalam) övladlarının sayı onun zövcələrinin sayı barədə deyilənlərlə uyğun deyil.**

Həmçinin, İmam Həsənin (əleyhissalam) övladlarının sayı barədə araşdırdıqda onların sayının hətta ən az deyilən 50 zövcənin sayı ilə uyğun olmadığını görürük. İbn Ənbə deyir: "Şeyx əş-Şərəf əl-Ubeydlinin rəvayətinə əsasən, Əbu Muhəmməd Həsənin 16 övladı olmuşdu. Onların beşi qız, on biri isə oğlan uşağı olmuşdu. Oğlanlar bunlar idi: Zeyd, Həsəni Musənna, Hüseyn, Təlhə, İsmail, Übeydullah, Həmzə, Yəqub, Əbdürrəhman, Əbu Bəkr, Ömər".[169]

Əbu Nəsr Buxari: **"Ağamız Əbu Muhəmməd Həsən bin Əli bin Əbu Talib (əleyhissalam) özündən sonra 13 oğlan və 6 qız qoyub getmişdi. Oğlanlardan yalnız ikisinin, qızlardan isə birinin soyu davam etmişdi".**[170]

Deməli, aydın olur ki, 19 oğlan və qız uşaqlarının olması nəinki 100 heç 50 zövcənin olması ilə də uyğun deyil.

19 övladın olması təbii və daha düzgündür. Əgər bu sayı indiki ürfümüzlə müqayisə etsək, görürük ki, iki zövcəsi olan insanın bu sayda övladı ola bilər.

**5. Şəriət evlilik əlaqəsinin davam etməsini təkid, talaq verməyi isə qadağan edir.**

Talaq hökmünün şəriət baxımından icazəli olmasının fəlsəfəsi evlilik həyatının davam etməsinin mümkün olmadığı hal ilə izah olunur. Yəni, elə şərait yaranır ki, ər talağa müraciət etməli olur. Lakin bununla yanaşı, şəriət evlilik əlaqəsinin davam etdirilməsini təkid edir və heç bir səbəb olmadan talaq verməyi qadağan edir. Hətta bu əməlin ailə və cəmiyyətin dağılmasına səbəb olduğu üçün

---

[168] "Şərhu nəhcil-bəlağə", c. 16, səh. 21.
[169] İbn Ənbə, "Umdətut-talib", səh. 68.
[170] Əbu Nəsr Buxari, "Sirru silsilə ələviyyə", səh.4.

qadağan olunması barədə dəhşət doğuracaq məzmunda rəvayətlər nəql olunmuşdur.

Bu barədə olan Peyğəmbərdən (səlləllahu aleyhi və alihi və səlləm) nəql olunan hədislərdə buyurulur: **"İslamda ayrılıqla dağılan bir ailə kimi Allahın nifrət etdiyi bir şey yoxdur".**[171]

İmam Sadiq (əleyhissalam) buyurub: **"Allahın halal etdikləri içərisində talaq qədər nifrət etdiyi bir şey yoxdur".**[172]

Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) belə buyurduğu nəql olunur: **"Evlənin, amma talaq verməyin! Talaq verildikdə ərş silkələnir"**.[173]

Burada belə bir sual yaranır; Məgər İmam Həsən (əleyhissalam) evlənmək üçün qadın seçərkən dəqiq araşdırma aparmayıb ki, bu qədər çox sayda mənfi halla rastlaşmasın?[174] Halbuki o, Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) nəslindəndir və məsum imamdır.

Əlbəttə, ağıl belə bir dedi-qodunu qəbul edə bilməz. Çünki İmam cənnət cavanlarının ağasıdır. O, İslam şəriətinin qadağalarını daha yaxşı bilir. İmam yüz dəfə və ya daha çox Allahın ərşini silkələyəcək bir əməl etməz. Bundan əlavə, bu əməl imamların əxlaq və ədəbləri ilə uyğun gəlmir. Hətta belə bir işin olması reallığa uyğun deyil.

**6. İmam Həsənin (əleyhissalam) yaşadığı reallıqlar bu sayda evliliyin mümkün olmadığını təsdiqləyir.**

İmam Həsənin (əleyhissalam) yaşadığı həssas və məşəqqətli dövr bu qədər çoxlu qadınla evlənməsinin mümkün olmadığını göstərir. Atasının imamlıq dövründə Siffin, Nəhrivan, Cəməl kimi döyüşlərin olması, özünün imamlıq dövründə isə Müaviyə ilə olan çəkişmələr, ümmətin onu anlamaması, ona qarşı vəfasızlıq etməsi və sonda zövcəsinin əli ilə zəhərlənərək şəhid olması o həzrətin nə qədər keşməkeşli həyat tərzi keçirməsini göstərir. Bütün bunlarla yanaşı, İmam Həsənin (əleyhissalam) fikri yalnız evlənmək və talaq verməkdə ola bilərdimi? Öhdəsində dinin, ümmətin gələcəyini Müaviyə kimi hiyləgərlərin təhlükəsindən qorunmaq məsuliyyəti olduğu halda o həzrətin belə işlərlə məşğul olmasını ağıl və məntiq qəbul etmir.

---

[171] Hürr Amuli, "Vəsail əş-Şiə", c. 2, səh. 16.

[172] "əl-Kafi", c. 6, səh. 54; "Sünəni Əbu Davud", c. 1, səh. 484.

[173] Hürr Amuli, "Vəsail əş-Şiə", c. 22, səh. 9; Siyuti, "əl-Came əs-Səğir", c. 1, səh. 505; "Təfsiru Qurtubi", c. 18, səh. 149.

[174] Yəni tutaq ki, bu deyilən sayda evlilikləri və boşanmaları qəbul etdik. İmam Həsən (əleyhissəlam) o qədər diqqətsiz və məsuliyyətsizdir ki, evliliyə adi bir iş kimi yanaşır və həyat yoldaşı seçərkən ciddiyyət nümayiş etdirmir? Haşa! Belə bir inancdan Allaha sığınırıq! (red.)

Deməli, qeyd etdiklərimizdən bu iddianın qondarma olduğu məlum olur. Bu iddia səhih sənədlərlə nəql olunsa da, heç vaxt düzgün ola bilməz. Çünki bu rəvayətlər onu etibardan salacaq Quran, sünnə və ağıl kimi bəzi meyarlara ziddir. Bir sözlə, bu rəvayətlər hər hansı bir şeyi isbat etmək üçün yararlı deyil. Rəvayətin məzmununun dəlalət etdiyi hadisə tamamilə uydurmadır.

**Xülasə**

Bu rəvayətlərin hamısı nöqsanlıdır. Çünki həmin rəvayətlər Quran, sünnə, tarix, ağıl və reallığın ehtiva etdiyi aksiomlara ziddir. Bu rəvayətləri təsdiqləyib qəbul edə bilmərik.

Deməli, bu şübhə İmam Həsənə (əleyhissalam) atılan bir iftiradan başqa bir şey deyil. İmam bu şübhədən uzaq və münəzzəhdir. Əvvəlki mövzularda İmam Həsənin (əleyhissalam) necə keşməkeşli bir dövr yaşadığını, ümmətin və ordusunun ona qarşı etdiklərini və İmamın hadisələrə necə hikmət, ağıl və məntiqlə yanaşaraq İslamı və şiələri qoruduğunu qeyd etmişdik.

**Üçüncü şübhə:**

**İmam Həsən və İmam Hüseynin döyüş və sülh məsələlərində ixtilaf etmələri**

Ortaya atılan şübhələrdən biri də İmam Həsənin (əleyhissalam) sülh bağlamağı seçməsidir. Nə üçün imam rahatlıq və rifahı cihad və şəhidlikdən üstün tutdu? Halbuki İmam Hüseyn (əleyhissalam) islah və cihad etməyi üstün tutdu və bununla da hər ikisinin həyat tərzi bir-birindən fərqləndi.

**Şübhənin cavabı:** Bu şübhənin cavabı üçün bəzi həqiqətlərin bilinməsi lazımdır.

**Birinci həqiqət: İslam şəriətində hərb və sülhün əsasları.**

İslam fiqhi sülhün və ya hərbin hər hansı birinin digərindən üstün olduğunu təsdiqləmir. Əksinə zərurətin tələbinə, islam və müsəlmanların mənfəətinə uyğun olaraq sülh və ya hərb dəsdəklənir. Zərurətin tələbinə uyğun olaraq düzgün qərar verilməli və biri digərindən üstün tutulmalıdır. Burada meyar şəraitin tələbinə uyğun olaraq istər sülh, istərsə də hərb olsun İslamın ən üstün mənfəətini təmin etməkdir.

**Fəqihlərin rəyləri**

Bu məsələ barədə fəqihlərin rəylərini araşdırdıqda görürük ki, onlar bu məsələdə müsəlmanların ümumi mənfəətini nəzərə almağı əsas məqsəd hesab edirlər.

**1. Əllamə Hilli**

Əllamə Hilli sülh və atəşkəs bağlamaq barədə deyir: **"Sülh heç bir əvəz olmadan müəyyən müddət üçün döyüşü saxlamaqdır. Müsəlmanların ümumi mənfəətinin təmin olunması ilə bu iş icazəlidir. Müsəlmanların sayının az olması, qarşı tərəfin İslamı qəbul etməsi və ya güc əldə etmək məqsədi kimi ehtiyacları olduğu halda isə vacibdir".**[175]

**2. Şəhid Sani**

Şəhid Sani deyir: **"Müsəlmanların sayı az olduqda və ya qarşı tərəfin İslamı qəbul edəcəklərinə ümid etdikdə və yaxud da sonradan güc əldə etmək məqsədilə müsəlmanların mənfəətinin təmin olunması şərti ilə bu iş icazəlidir. Həmçinin, bunun icazəli olması ilə yanaşı əgər müsəlmanların sülhə ehtiyacları olarsa, sülh bağlamaq vacibdir. Ehtiyac həddinə çatmasa da sadəcə mənfəət üçün bu iş mubah ola bilər. Əgər mənfəət aradan gedərsə, (sülh bağlamağın) düzgünlüyü də aradan gedər".**[176]

**3. Əllamə Təbərsi**

Əllamə Təbərsi deyir: **"İmam özü və ya müsəlmanların həyatı üçün qorxarsa, kafirlər və azğınlarla sülh bağlamaq icazəlidir. Necə ki, Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) Hüdeybiyyədə, Əmirəlmöminin (əleyhissalam) Siffində və İmam Həsən (əleyhissalam) özü və şiələrinin həyatı üçün qorxduqda Müaviyə ilə sülh bağlamışdı".**[177]

**4. Əllamə Murtəza Mütəhhəri**

Mütəhhəri deyir: **" Əgər bizdən "İslam sülh dinidir, yoxsa hərb dini?" – deyə soruşsalar nə cavab verməliyik? Əgər Qurana müraciət etsək hərb qanunlarının olması ilə yanaşı sülh qanunlarının da olmasını görürük. Kafir və müşriklərlə müharibə etməyə çağıran çoxlu ayələr vardır. Allah-təala buyurur: *"(Ey möminlər!) Sizinlə vuruşanlarla siz də Allah yolunda vuruşun, lakin həddən kənara çıxmayın. Allah həddi aşanları sevməz!"* (Bəqərə surəsi, ayə 190). Başqa bir ayədə isə belə buyurulur**: ***"Sülh daha xeyirlidir"* (Nisa surəsi, ayə 128).**

---

[175] Əllamə Hilli, "Qəvaidul-əhkam", c. 1, səh. 516.
[176] Şəhid Sani, "Şərhul-lumə əd-diməşqiyyə", c. 2, səh. 35.
[177] Təbərsi, "Təfsiru məcməil-bəyan", c. 2, səh. 35.

**Bəs İslam bunlardan hansının dinidir? İslama görə, nə sülh, nə də ki hərb əsas hesab olunur. Bunların hər ikisi şərait və məqsədə bağlıdır. Müsəlmanlar istər Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) zamanında, istər İmam Əlinin (əleyhissalam), istər İmam Həsənin (əleyhissalam), istərsə də İmam Hüseynin (əleyhissalam) və ya digər imamların zamanında olsunlar, ümumiyyətlə dövrdən asılı olmayaraq hər bir halda öz hədəflərini yerinə yetirməlidirlər. Hədəf isə İslam və müsəlmanların hüquqları olmalıdır. Şəraiti və vəziyyəti nəzərə almaları vacibdir. Əgər bu hədəfi həyata keçirmək üçün döyüş ən yaxşı yoldursa, onlar bunu da etməlidirlər. Əgər bu hədəfi həyata keçirmək üçün sülh bağlamaq ən yaxşı yoldursa, onlar məhz bu yolu seçməlidirlər".**[178]

**5. Əllamə əl-Eyni**

Əllamə əl-Eyni deyir: **"Səhabələrimiz belə deyir: "Əgər sülh bağlamaq müsəlman üçün xeyirli olarsa, kafirlərdən mal almaq və ya onlara mal vermək müqabilində sülh bağlamaq icazəlidir".**[179]

Deməli, sülh və hərb insanların hüquqlarının və mənfəətlərinin qorunması üçün icazəlidir. Bu mənfəət ikisindən birini təyin edir. Bu zərurətin tələbinə əsasən İmam və ya hakim ən uyğununu seçə bilər.

**İkinci həqiqət: Rolların müxtəlifliyi, hədəfin vahid olması**.

Seyid Şəhid Sədr məhz bu ifadəni işlədərək deyir: **"Mənim əqidəmə görə, imamların hamısının müştərək bir vəzifə icra etmələri sadəcə bir fərziyyə deyil ki, onun isbatı üçün tarixi arqument və faktlar axtaraq. İmamların müştərək vəzifə icra etmələri əqidənin vacib tərkib hissəsi və imamət fikrinin əsasıdır. Çünki imamət bütün məsuliyyəti və şərtləri ilə onların hər birinə nisbətdə eynidir. Buna əsasən də şərait və vəziyyətə görə icra etdikləri vəzifə nə qədər fərqli olsa da, imamların vəzifə məsuliyyətlərində eyni dərəcədə öz əksini tapmalıdır. İmamlar birlikdə bütöv bir varlığın bir-birilə bağlı hissələrini formalaşdırırlar. Hər bir hissə öz rolunu yerinə yetirir ki, növbəti hissə öz rolunu yerinə yetirə bilsin və bununla bütövlük tamamlansın".**[180]

Şiə əqidəsinə əsasən, imamların vəzifələri üslub və metodda bir-birini tamamlayan bütöv varlığın hissələri kimidir. Baxmayaraq ki, əhli-beyt imamlarından hər birinin yaşadığı vəziyyət və şəraitə görə vəzifələr bir-birindən

---

[178] Mütəhhəri, "Siyrətul-əimmətil-əthar", səh. 68.
[179] əl-Eyni, "Umdətul-qari", c. 14, səh. 18.
[180] Muhəmməd Baqir Sədr, "Əhlul-beyt tənəvvəul-ədvar və vəhdətul-hədəf", səh. 142.

fərqli olmuşdur. Lakin dəyişməyən yeganə şey hədəf idi. Hədəf isə İslamın qorunmasdır.

Seyid Muhəmməd Baqir Sədrin əsasını qoyduğu bu nəzəriyyəyə əsasən, baş verənləri bir-birindən ayırmaq mənasızdır. Yəni, nə üçün İmam Həsən (əleyhissalam) Müaviyə ilə sülh bağladı və İmam Hüseyn (əleyhissalam) Yezidə qarşı vuruşaraq şəhid oldu? – deyə təəccüblənməyin mənası yoxdu. Bu iki mövqe arasında heç bir ziddiyyət yoxdur. Hər iki mövqe düzgündür və hər iki İmamın yaşadığı şərait və vəziyyətə tamamilə münasibdir. Hədəf isə İslam dinini təhrifdən və zəlalətdən qorumaq olmuşdur.

İmam Hüseyn (əleyhissalam) İmam Həsəndən (əleyhissalam) yaş etibarilə böyük olmaqla ondan əvvəl imamlıq etsəydi, o da Müaviyə ilə sülh bağlayardı. Həmçinin, İmam Həsən (əleyhissalam) də Yezidlə vuruşar və bu müqəddəs hədəf uğrunda canından keçərdi.

**Ümmət İmam Həsənin (əleyhissalam) zamanında şəkk xəstəliyinə tutlmuşdu.**

Seyid Şəhid Baqir Sədrin dediyi kimi, ümmət İmam Həsənin (əleyhissalam) dövründə sınaq və şəkk xəstəliyi mərhələsini yaşayırdı. Həmçinin, atası Əmirəlmöminin Əlinin (əleyhissalam) zamanında ümmət bu halı yaşamışdı.

**“Bu şəkk Əmirəlmöminin Əlinin (əleyhissalam) zamanında yaranmışdı. Halbuki, onun yaranmasının hər hansı obyektiv səbəbləri yox idi. Buna baxmayaraq, şəkk kök salmağa başladı və əzəmətli İmam (əleyhissalam) bu halın əziyyətini çəkməli oldu. İmam şəhadətə yetişərək dünyadan köçdü, lakin ümmət yenə də şəkk içində idi... Bundan sonra ümmət yenə şəkkə təslim olub İmam Həsənin (əleyhissalam) qarşısında ölü kütləyə çevrildi. Bütün bu hallarda ümmətin şəkk içində olmasının heç bir obyektiv səbəbi yox idi. Əgər bu şəkkin obyektiv səbəbi olsaydı, görəsən ümmət necə mövqe sərgiləyərdi?!”**[181]

İmam Həsən (əleyhissalam) ümmətdəki bu şəkk xəstəliyini necə həll edə bilərdi?! İmam yeganə və düzgün olan həll yolunun Müaviyə ilə sülh bağlamaqda gördü. Bu həll yolunu seçməyin müəyyən səbəbləri vardı. Çünki Müaviyə ümməti aldadıb özünü şəri xəlifə elan etmək istəyirdi. Aşağıda bu səbəbləri izah edəcəyik. İmam Hüseynə (əleyhissalam) gəlincə, Seyid Baqir Sədrin dediyi kimi, həmin vaxt ümmətin iradəsi zəifləmiş və məhv olmuşdu. Artıq ümmətin batilə qarşı “yox” deməyə iqtidarı qalmamışdı. Onun əli də, dili də şəhvani hisslərin köləsinə

---

[181] Muhəmməd Baqir Sədr, “Əhlul-beyt tənəvvəul-ədvar və vəhdətul-hədəf”, səh. 11-12.

çevrilmiş, fəsadın hökm sürdüyü vəziyyəti dəyişmək istəyində deyildi. Qəlbləri İmamla, qılıncları isə ona qarşı idi.[182] O, bu sözləri ilə Fərəzdəqin İmama dediyi sözlərə işarə edirdi: **“Kufədən çıxıb gedərkən yolda Hüseynlə (əleyhissalam) qarşılaşdım. O, mənə: “Ey Əbu Firas, arxanda nə qoyub gəldin?” - deyə soruşdu. Mən dedim: “Doğrusunu deyimmi?” (İmam) dedi: “Doğrunu istəyirəm”. Mən dedim: “Qəlblər səninlə, qılınclar isə Bəni Üməyyə ilədir. Qələbə isə Allahdandır”. (İmam) buyurdu: “Həqiqətən də sən mənə doğrunu söylədin. İnsanlar var-dövlətin qullarıdır. Din isə ağızlarında çiynədikləri bir şeydir. Yaşayışlarını təmin etdikcə o tərəf, bu tərəfə dolandırarlar. Bəla ilə üzləşdikdə, dindarların sayı azalar”.**[183]

İmam Hüseynin (əleyhissalam) inqilabı və şəhadəti ümməti qəflət yuxusundan oyadıb Rəsulullahın (səlləllahu aleyhi və alihi və səlləm) gətirdiyi doğru dini yenidən dirçəltmək üçün ruhlandırdı.

Bu iki əməlin – sülh və hərbin (İmam Həsənin sülhü və İmam Hüseynin savaşı) arasında heç bir ziddiyyət və ayrılıq yoxdu.

**Üçüncü həqiqət: Əməvi sülaləsi dini mülk və səltənət hesab edirdi.**

**Əbu Süfyanın “Bu bir səltənətdir. Nə cənnətin, nə də cəhənnəmin nə olduğunu bilirəm” sözləri.**

Həsən Bəsrinin rəvayət etdiyi və İbn Əbdülbirrin yazdığı kimi, Əbu Süfyan məşhur sözlərini deyərkən bu həqiqəti təmsil edirdi. Həsən Bəsridən belə nəql olunur: **“Xilafət Osmana yetişdikdə Əbu Süfyan onun yanına gəlib dedi: “Teym və Udəy tayfasından sonra (xilafət) sənə gəlib çatdı. Bir kürə kimi bir-birinizə ötürün. (Xilafətin) əsas sütunlarını Bəni Üməyyədən seç. Bu bir səltənət məsələsidir. Mən nə cənnət, nə də cəhənnəmin nə olduğunu bilirəm”.**[184]

Həmçinin, Əbu Süfyan Fəth ilində Abbasa belə demişdi: **“Qardaşın oğlunun səltənəti çox böyük oldu”. Abbas ona dedi: “Vay olsun sənə! Bu, səltənət deyil, peyğəmbərlikdir”.**[185]

Deməli, Əbu Süfyanın nəzərində həzrət Muhəmməd (səlləllahu aleyhi və alihi və səlləm) hakimiyyət məqsədi güdürdü. Onun nəzərində nə Cənnət var, nə də Cəhənnəm.

---

[182] Muhəmməd Baqir Sədr, “Əhlul-beyt tənəvvəul-ədvar və vəhdətul-hədəf”, səh. 200.
[183] “Kəşful-ğummə”, c. 2, səh. 241.
[184] “əl-İstiyab”, c. 4, səh. 1679; İbn Əqil, “ən-Nəsaih əl-Kafiyə”, səh. 110.
[185] “əl-Musəmul-səğir”, c. 2, səh. 75; “Tarixul-islam”, c. 2, səh. 541; “Şərhu nəhcil-bəlağə”, c. 15, səh. 175.

**Müaviyənin sözü.**

Bu məsələ onun oğlu Müaviyədə daha aşkar surətdə özünü biruzə vermişdi. O da atasından irs aldığı yolla hərəkət edirdi. Aşağıda qeyd edəcəyimiz Müaviyə ilə Muğirə bin Şöbənin arasında baş verən dialoqun mətni bu məsələni bütün çılpaqlığı ilə ehtiva edir.

Zubeyr bin Bəkkar[186] Mutrif bin Muğirə bin Şöbənin belə dediyini nəql edir: **"Atam Müğirəni Müaviyənin hüzuruna apardım. Atam adətən onun yanına gedər və onunla söhbət edərdi. Qayıdandan sonra mənə Müaviyənin ağıl və məntiqindən danışar və onun bu qüdrətindən təəccüb edərdi. Həmin gecə gəldi və şam yeməyini də yemədi. Onun qəm-qüssəyə batdığını gördüm. Bir az gözlədim. Elə güman etdim ki, evdə və ya işimizlə bağlı nəsə baş verib. Sonra ona dedim: "Ata, gecədən bəri səni qəm-qüssə içində görürəm. Nə olub?" Atam dedi: "Oğlum, mən ən xəbis adamın yanından gəlirəm". Mən: "Kimdir o?" - deyə soruşdum. Atam dedi: "Onunla tək idim. Dedim ki, ey möminlərin əmiri, artıq yaşlanmısan. Bəlkə bir az ədalətli davranasan, insanlara qarşı xeyirxah olasan. Bəni Haşimdən olan qardaşlarına mərhəmət göstərəsən. Allaha and olsun ki, bu gün onlardan qorxmaq üçün bir səbəb yoxdu". O isə mənə belə dedi: "Əsla yox! Əsla yox! Teym tayfası hakim oldu, ədalətlə davrandı. Etdiyini etdi. Allaha and olsun ki, ölən kimi xatirəsi də öldü. Yalnız kimsə xatırlayanda Əbu Bəkr deyir. Sonra Udəy hakim oldu. Səy etdi, qollarını çırmaladı və on il hakim oldu. Allaha and olsun ki, həlak olan kimi xatirəsi də həlak oldu. Yalnız kimsə xatırlayanda Ömər deyir. Sonra qardaşımız Osman hakim oldu. Elə adam hakim oldu ki, əsil-nəcabətdə ona tay biri yox idi. O da edə bildiklərini etdi. Allaha and olsun ki, o da həlak olan kimi onun da xatirəsi və etdikləri məhv oldu. Bəni Haşimin isə adı gündə beş dəfə (minarələrdən) qışqırıqla deyilir: "Əşhədu ənnə Muhəmmədən rəsulullah!" Anan vayına otursun, bunun müqabilində hansı əməl yadda qalar! Yox! Allaha and olsun ki, bir-bir onları dəfn edəcəyəm!"[187]**

Əgər Müaviyənin imkanı olsaydı, Bəni Haşimdən alov üfürəcək bir sağ adam qalmayacaqdı. Əmirəlmöminin Əli (əleyhissalam) məhz buna işarə edərək buyurub: "Allaha and olsun, Müaviyə Allah nurunu söndürmək üçün istəyir ki,

---

[186] İbn Əbilhədid onun barəsində belə deyir: *"O, Müaviyənin əleyhinə olanlardan deyildi. Həmçinin şiə də hesab olunmurdu. Məlumdur ki, o, İmam Əlidən (ə) ayrı düşmüş və onun yanında olmamışdı."*

[187] Zubeyr bin Bəkkar, "əl-Muvəffəriyyat", səh.462; "Şərhu nəhcil-bəlağə", c. 5, səh. 130; "ən-Nəsaih əl-Kafiyə", səh. 142; "Kəşful-ğummə", c. 2, səh. 46; "Biharul-ənvar", c. 33, səh. 169.

Bəni Haşimdən alov üfürəcək[188] bir adam qalmasın. Ta onların meyitlərini təhqir eləsin. Allah müşriklər istəməsələr belə Öz nurunu tamamlayacaq”.[189]

Müaviyənin bütün etdikləri ilə yanaşı ümmət şəkk içində yaşayırdı. Çünki “Müaviyə öz siyasi və idarəçilik həyatına Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) vəfatından qısa müddət sonra başlamışdı. O, Şama vali olaraq getmişdi. Ümmət içərisində hamının hörmət bəslədiyi Ömər bin Xəttabın tərəfindən orada hörmət və izzət gördü. Hətta Ömər bin Xəttab valilərini ədəbləndirmək istədikdə Müaviyə bin Əbu Süfyanı bu prosesdən kənar tutmuşdu. Təyin etdiyi valilərin mallarını bölmək istəyərkən Müaviyəni bundan istisna etdi. Müaviyə Ömər bin Xəttabın nəzərində etibarlı vali və islam baxımından hörmətli biri idi. Ondan sonra hakimiyyətə gələn Osman Müaviyənin hakimiyyət ərazisini bir az da artırdı. Şamdan əlavə bir neçə əyalətin də hökmüranlığını onun ixtiyarına verdi. Əbu Süfyanın oğlunda heç bir dəyişiklik olmadı. Müaviyə tamamilə aşkar olunmuş bir adam deyildi. O, ictimai və islamın hörmətini qoruyan bir insan kimi özünü tanıtdırmışdı.”[190] Müaviyə əməlisaleh və İslam müdafiəçisi kimi özünü tanıtdırdığı üçün İmam Həsən (əleyhissalam) onun şəxsiyyətinin üzərindəki örtüyü açmalı idi. Yezidə gəlincə isə, o, fisq və günahla tanınan bir idi. Onun haqdan uzaq olması barədə heç kimin qəlbində zərrəcə şübhə yox idi.

İmam Həsən (əleyhissalam) ümmətin şəkk halında olduğunu bilirdi. Həmçinin, hadisələrin gedişatından, ordusunda baş qaldıran dönüklük və Müaviyənin insanları satın almasından bilirdi ki, döyüşə girərəcəyi təqdirdə əsir düşəcək və bütün şiələri qətlə yetiriləcək. Bununla da Müaviyə ictimai rəyi istədiyi kimi formalaşdıracaq, həqiqətləri və tarixi təhrif edəcəkdi. Öz istədiyi şərtləri irəli sürəcəkdi. Bununla da İslamın məhvi üçün ilk təməl daşını qoymuş olacaq, Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) gətirdiyi İslamdan tamamilə fərqli, əməvi meyarlarına uyğun bir islam dini formalaşdıracaqdı. Ya da İmam özünü və şiələri qorumalı, Müaviyənin iç üzünü insanlara açacaq şərtlər irəli sürməli və bununla da ona planlaşdırdığı əməllərini yerinə yetirməyə fürsət verməməli idi.

Həqiqətən də sülh Əməvi planını pozan və İmam Həsənin planının müvəffəqiyyətlə baş tutması üçün ilk toxum idi. Sülhün uğurlu olmasına ən gözəl dəlil Müaviyənin İmam Həsənin (əleyhissalam) şərtlərini qəbul etdikdən bir neçə gün sonra söylədiyi sözdür: **“Allaha and olun ki, mən sizinlə namaz qılmanız, zəkat verməniz, həccə getməniz üçün vuruşmadım. Siz onsuz da bunları**

---

[188] Böyük və kiçik insana işarədir. Çünki böyük yaxud kiçik olan hər bir kəs alovu üfürə bilir. Bəni Haşimdən olan hər kəsi öldürmək istədiyinə işarədir.
[189] İbn Quteybə, “Ğəribul-hədis”, c. 1, səh. 367.
[190] Muhəmməd Baqir Sədr, “Əhlul-beyt tənəvvəul-ədvar və vəhdətul-hədəf”, səh. 110.

**edirsiniz. Mən sizə hakim olmaq və sizi ixtiyarıma keçirmək üçün sizinlə vuruşdum. Siz istəməsəniz də Allah bunu mənə bəxş elədi”.**[191]

Başqa bir rəvayətdə belə dediyi qeyd olunur:

**“Elə bilirsiniz ki, sizinlə namaz, zəkat, həcc üçün vuruşdum. Bilirəm ki, siz namaz qılır, zəkat verir və həccə gedirsiniz. Mən sizə hakim olmaq və sizi ixtiyarıma keçirmək üçün sizinlə vuruşdum. Siz istəməsəniz də Allah bunu mənə bəxş elədi. Bu fitnədə gedən hər bir mal, tökülən hər bir qan hədərə getmişdir. Kəsdiyim hər bir şərt iki ayağımın altındadır”.**[192]

Bu sözlərlə Müaviyə öz iç üzünü göstərmiş oldu. Onun məqsədi namaz, oruc və ya həcc deyil, hakimiyyət və səltənətdir. Ondan əvvəl atası məhz bu sözləri demişdi: **“Əbu Süfyanın inandığına and olsun ki, nə əzab var, nə hesab, nə Cənnət var, nə də Cəhənnəm, nə dirilmək var, nə də qiyamət”.**[193]

Həmçinin oğlu Yezidin xəlifə olması üçün zor gücünə insanlardan beyət alarkən belə demişdi: **“Mən sizə bir şey demək istəyirəm. Xəbərdarlıq edən şəxs üzürlüdür. Əvvəllər mən sizin aranızda danışarkən bir nəfər yerindən qalxıb insanların gözü qarşısında məni təkzib edərdi. Mən də buna dözüb onu bağışlayardım. İndi sizə bir söz deyəcəm. Allaha and olsun, kim mənim bu sözümü kəssə, ona bir cavab verilməmiş qılınc başına endiriləcək. Sözümü kəsən hər kəs özünü ölümə atmışdır”. Sonra keşikçini çağırıb dedi: “Bu adamların hər birinin başı üzərində iki adam saxla. Hər birinin əlində qılınc olsun. Əgər kim mənim sözümü kəsib məni təsdiq və ya təkzib eləsə, qılıncla onun boynun vursunlar.”**[194]

Müaviyə Yezidin xəlifəliyə layiq olmadığını çox yaxşı bilirdi. Çünki Yezid şərab içən, meymun oynadan və haqsız yerə insan qətlə yetirən biri idi. Abbasi xəlifəsi Mutəzid Billah Müaviyənin oğlu Yezidi necə xəlifə seçməsini şərh edərək deyir: “O, oğlunu Allahın dinindən üstün tutmuş, insanları qorxu, hədə, zülm və məcbur etməklə təkəbbürlü, şərabxor, xoruz döyüşdürən, şir və meymun saxlayan Yezidə beyət etməyə çağırmışdı. O, oğlunun səfeh olmasını, xəbisliyini, günaha aludə olduğunu, fasiq və kafir olduğunu bilir, onun sərxoş olduğunu görürdü. İmkanı çatan kimi oğlunu (xəlifə) olmağa hazırladı. O, (Yezid) Allaha və Peyğəmərə qarşı çıxdı. Müsəlmanlardan müşriklərin qisasını aldı. Hürrə əhlinə qarşı elə cinayət işlədi ki, İslamda ondan faciəli bir hadisə olmamışdı. Əməlisaleh insanlara qarşı günah elədi. Bununla da içindəki kin-küdurət alovunu söndürüb

---

[191] İbn Əbu Şeybə, “əl-Musənnəf”, c. 7, səh. 251; Qazi Numan Məğribi, “Şərhul-əxbar”, c. 2, səh. 533.
[192] “Şərhu nəhcil-bəlağə”, c. 16, səh. 15.
[193] “Şərhu nəhcil-bəlağə”, c. 9, səh. 53.
[194] “əl-Kamil-fit-tarix”, c. 3, səh. 510.

təsəlli tapdı. Belə güman etdi ki, bununla Allah dostlarından intiqam aldı və Allah düşmənlərinin arzuladığına çatdı. Küfrünü aşkar, şirkini izhar edərək dedi:

Kaş Bədrdə olan ağsaqqallarım görəydi

Qılıncların zərbəsindən Xəzrəcin ağrı-acısını

Sizin ağalarınızdan ən əzəmətlilərini öldürdük

Bədrə bərabər qətl törətdik, ölənlərin sayı bərabər oldu

Sevinərdilər, bir-birlərini təbrik edərdilər

Sonra da deyərdilər: Ey Yezid, yetər artıq.

Bəni Həşim hakimiyyət oyunu oynayırdı

Yoxsa nə qeybdən xəbər gəlib, nə də vəhy nazil olub.[195]

Əgər fərz etsək ki, İmam Həsən (əleyhissalam) şəhidlik yolunu seçsəydi, nəzərdə tutduğu məqsədə - Müaviyənin hiyləsindən İslamı qorumaq məqsədinə çata biləcəkdimi? Yoxsa nəticə Müaviyənin xeyrinə olacaqdı və ümmət bu günə kimi şəkk-şübhə içində qalacaqdı?

Təəssüflər olsun ki, hətta bu gün də ümmət arasında təfriqə yaradan Müaviyəni müdafiə edən insanlar var. Əqqad çox böyük cürətlə belə deyir:

**Əgər tarix ona düzgün qiymət versəydi, onu insanlar arasında təfriqə salan şəxs kimi səciyyələndirərdi. Lakin əsas tarixi oxuyan şəxsin hadisələrə və insanlara verdiyi dəyərdi. Tarixçilərdən eləlləri də vardır ki, Müaviyənin hakimiyyətə gəldiyi ili camaat ili adlandırırlar. Çünki o, ümməti parça-parça etmişdi. Ümmət elə hala gəldi ki, heç vaxt vəhdət yarada bilmədi".[196]**

Əgər İmam Həsən (əleyhissalam) bağladığı sülhlə Müaviyənin tarixini və törətdikləri əməlləri aşkar etməsəydi necə olardı?

Bütün bunlardan sonra İmam rifah və rahatlığı seçdiyi üçün şəhid olmadı, ölümü seçmədi demək doğrudurmu?

---

[195] "Tarixu Təbəri", c. 8, səh. 187.
[196] Əqqad, "Müaviyə", səh. 42.

## SON

Qeyd etdiklərimizə əsasən deyə bilərik ki; İmam Həsən (əleyhissalam) sülh bağlayarkən İslamın mənfəətini düşünürdü. Onun şəri vəzifəsi şərait və vəziyyətə görə bu həll yolunu seçməyi tələb edirdi. İmam Həsəni (əleyhissalam) qardaşı İmam Hüseynə (əleyhissalam) nisbətdə şücaətsizlikdə ittiham etmək ağılsızlıqdır. Hər bir imamın özünə məxsus mərhələsi vardı və hər bir imam öz mərhələsinə uyğun olaraq əməl etmişdi. Bundan əlavə istənilən hadisə barədə hökm vermədən əvvəl onu hər tərəfli araşdırmaq və öyrənmək lazımdır.

Bir tərəfdə lider və ümmət, digər tərəfdə isə qəddar düşmən. İmamın rəhbərlik etdiyi ümmət onun planlaşdırdığı təbii yolla hərəkət edəcək, yoxsa ümmət qeyd etdiyimiz kimi şəkk xəstəliyinə mübtəla olub ona itaət etməyəcək? Buna görə də lider bu xəstənin düçar olduğu xəstəliyi sağaltmalı və onu təbii halına qaytarmalıdır. Məhz bu səbəbdən sülh müqaviləsi bağlandı ki, ümmətin içindəki yatmış ruhlar oyansın və öz mötədil vəziyyətinə qayıtsın. İslam dini az qalsın ki, Müaviyənin əməlləri ilə aradan gedəcəkdi. Lakin sülh müqaviləsi bütün hiylələri ifşa etdi və ümmət üçün hazırlanmış mənfur planların üstünü açdı. Sülh müqaviləsi İmamın hikməti və məntiqinin zəruri nəticəsi idi. Bunun sayəsində Müaviyə əlindəki bütün planları itirdi. O Müaviyə ki, İbn Abbas onun haqqında belə deyir: “Bu kişini (İmam Əlini) nə vaxtadək təhqir edəcəksən?” Müaviyə dedi: “O vaxtadək edəcəm ki, kiçiklər bu tərbiyə ilə böyüsün və böyüklər də bununla qocalsın”.[197] O, bu sözləri ilə İmam Əlini (əleyhissalam) söyməyi, onun tarixini dəfn etməyi nəzərdə tuturdu. Bununla da bütün İslamı dəfn etmək istəyirdi. “Lakin bu, həyata keçməyən bir arzu oldu, ey Şamın tağutu! Sənin hiylə məkrinə baxmayaraq bütün əsrlərdə və hər yerdə kiçik də, böyük də Əlinin (əleyhissalam) həyatını, tarixini unutmayaraq uca tutdu. Sən istəməsən belə, Allah Öz nurunu tamamlamaq istədi...”[198]

Aləmlərin Rəbbi olan Allaha həmd olsun! Muhəmməd və onun pak Əhli-beytinə Allahın salam və salavatı olsun!

---

[197] Cahiz, “Usmaniyyə”, səh. 285.
[198] Kamil Süleyman, “Həsən bin Əli”, səh. 180.

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


1. Qurani-kərim.
2. Nəhcul-bəlağə.
3. Əhməd bin Əli Təbərsi, “əl-İhticac”, Seyid Muhəmməd Baqir Sədrin haşiyəsi ilə. (Nəcəf, Darun-numan mətbəəsi 1386 h.q.)
4. Muhəmməd Təqi Tustəri, “əl-Əxbar əd-dəxilə” (Tehran, Səduq mətbəəsi.)
5. Şeyx Mufid, “əl-İrşad”. (Beyrut, Mufid mətbəəsi.)
6. Yusif bin Əbdulbirr, “əl-İstiab”. (Beyrut, Darul-cil mətbəəsi.)
7. Əhməd bin Həcər Əsqəlani, “əl-İsabə”. (Beyrut, Darul-kutubil-ilmiyyə mətbəəsi.)
8. Muhəmməd Təqi əl-Həkim, “Usulul-ammə lil-fiqhil-muqarin”. (Alul-beyt müəssisəsi.)
9. Nasir bin Abdullah Qəffari, “Usulu məzhəbiş-şiə”. (Daru-rza mətbəəsi.)
10. Mahmud Əbu Rəyya, “Əzva alə əs-sünnə ən-nəbəviyyə”, (Bətha çapı)
11. Xeyrəddin Zərkəli, “əl-Əlam” (Beyrut, Darul elm lilmalayin mətbəəsi 1980.)
12. Muhsin Əmin, “Əyanuş-şiə”, (Beyrut, Darut-təaruf mətbəəsi.)
13. Fuad Əhməd, “İmam Həsən əl-qaid vət-tarix”, (Beyrut, Darul-bəyanul-ərəbi mətbəəsi.)
14. Abdullah bin Muslim bin Quteybə Dinəvəri, “əl-İmamə vəs-siyasə”, (Misir çapı)
15. Muhəmməd Baqir Sədr, “Əhlul-beyt tənəvu ədvarin və vəhdətu hədəf”, (Beyrut, Darut-təaruf mətbəəsi.)
16. Muhəmməd Baqir əl-Məclisi, “Biharul-ənvar”. (Beyrut. Muəssəsətul-vəfa.)
17. İsmail bin Kəsir, “əl-Bidayə vən-nihayə”, (Beyrut. Dar ihyaut-turasil-ərəbi mətbəəsi.)
18. Muhəmməd bin Murtəza əz-Zubeydi, “Tacul-ərus”. (Beyrut. Darul-fikr mətbəəsi.)
19. Əbdurrəhman bin Xəldun, “Tarixu İbn Xəldun”. (Beyrut. əl-Ələmi müəssisəsi.)
20. Şəmsuddin Muhəmməd əz-Zəhəbi, “Tarixul-İslam”. (Beyrut. Darul-kutubil-ərəbi, 1408 h.q.)
21. Cəlaluddin əs-Süyuti, “Tarixul-xuləfa”. (Misir. 1371 h.q.)
22. Muhəmməd bin İsmail əl-Buxari, “Tarixus-səğir”. (Beyrut. Darul-mərifə mətbəəsi.)

23. Muhəmməd bin Cərir ət-Təbəri, “Tarixut-Təbəri”. (Beyrut. əl-Ələmi müəssisəsi.)
24. Əhməd bin Yəqub əl-Yəqubi, “Tarixul-Yəqubi”. (Beyrut. Darus-səfa mətbəəsi.)
25. Əbu Bəkr bin Xətib əl-Bağdadi, “Tarixu Bağdad”. (Beyrut. Darul-kutubil-ilmiyyə mətbəəsi.)
26. Həsən bin Əli bin Şubə əl-Hərrani, “Tuhəful-uqul”. (Qum. ən-Nəşr əl-İslami müəssisəsi.)
27. Şəmsuddin Muhəmməd əz-Zəhəbi, “Təzkirətul-huffaz”. (Beyrut. Dar ihyaut-turasil-ərəbi mətbəəsi.)
28. Əli bin Əsakir, “İmam Həsənin tərcümeyi-halı”; Şeyx Muhəmməd Baqir Mahmudinin təhqiqi ilə. (Beyrut. 1400 h.q.)
29. Muhəmməd bin Əhməd əl-Qurtubi, “Təfsir Qurtubi”. (Beyrut. Dar ihyaut-turasil-ərəbi mətbəəsi.)
30. Muhəmməd bin Huseyn ət-Təbatəbai, “Təfsirul-mizan”.
31. Fəzl bin Həsən ət-Təbərsi, “Məcməul-bəyan”. (Beyrut.)
32. Şərif Murtəza, “Tənzihul-ənbiya”. (Beyrut. Darul-əzva mətbəəsi. 1409 h.q.)
33. Cəlaluddin əs-Süyuti, “əl-Cami əs-Səğir”. (Beyrut. Darul-fikr mətbəəsi. 1401 h.q.)
34. Kamil Süleyman, “Həsən bin Əli”. (Beyrut. Darul-məarif mətbəəsi)
35. Seyid Hamid Nəqəvi, “Xülasətu Əqəbatul-ənvar”. (İran çapı)
36. Cəlaləddin əs-Süyuti, “əd-Dürrul-mənsur fit-təfsiri bil-mənsur”. (Beyrut. Darul-məarif və Müəssisətur-risalə mətbəələri)
37. Adil Ədib, “Dövru əimmətu əhlil-beyti”. (Beyrut çapı)
38. Şeyx ət-Tusi, “ər-Rəsail əl-əşər”. (Qum çapı)
39. Corc Cordaq, “Rəvaiu nəhcil-bəlağə”.
40. Əbu Nəsr Buxəl-ari, “Sirru silsilə ələviyyə”.
41. “Sünənu Əbu Davud əs-Sicistani” (Beyrut. Darul-fikr mətbəəsi.)
42. Əbu İsa ət-Tirmizi, “Sünənut-Tirmizi”. (Beyrut. Darul-fikr mətbəəsi.)
43. Şəmsuddin Muhəmməd əz-Zəhəbi, “Siyəru əlamun-nubəla”. (Beyrut. Müəssisətur-risalə mətbəəsi)
44. Murtəza Mutəhhəri, “Siyrətu Əimməti-l-əthar”. (Beyrut çapı)
45. Qazi Numan Məğribi, “Şərhul-əxbar”. (Qum çapı)
46. Zeynuddin bin Əli Şəhid Sani, “Şərhuluməd-diməşqiyyə”. (Nəcəf çapı)
47. Muhəmməd Cavad Muğniyə, “əş-Şiə fil-Mizan”. (Beyrut çapı)
48. Muhəmməd İsmail bin Muğirə əl-Buxari, “Səhih Buxari”. (Beyrut. Darul-fikr mətbəəsi. 1401 h.q.)
49. Müslim ən-Nişapuri, “Səhih Müslim”. (Beyrut. Darul-fikr mətbəəsi.)

50. Muhəmməd Cavad Fəzlullah, “Sulhul-Həsən əsbabuhu və ntaicuhu”. (Qum)
51. Şeyx Razi Ali Yasin, “Sulhul-İmam Həsən”.
52. Əhməd bin Həcər əl-Heytəmi, “əs-Səvaiqul-muhriqə”. (Beyrut. Müəssisətur-risalə mətbəəsi)
53. Cahiz, “əl-Usmaniyyə”. (Misir. Darul-kutubil-ərəbi mətbəəsi)
54. Şeyx ət-Tusi, “Uddətul-usul”. (Qum çapı)
55. Əqqad, “Müaviyə”. (Misir çapı)
56. Muhəmməd bin Əli bin Ənbə, “Umdətul-talib”. (Nəcəf çapı)
57. Mahmud din Əhməd əl-Eyni, “Umdətul-qari”. (Beyrut. Dar ihyaut-turasil-ərəbi mətbəəsi.)
58. Muhəmməd bin Əli Hüseyn bin Babaveyh Qummi, “İləluləş-şərai”. (Nəcəf)
59. Əbdulhüseyn Əhməd Əmini, “əl-Ğədir”. (Darul kutubil-ərəbi mətbəəsi, 1398 h.q.)
60. Abdullah bin Muslim bin Quteybə, “Ğaribul-hədis”. (Darul-kutubil-ilmiyyə mətbəəsi)
61. Əhməd bin Həcər əl-Əsqəlani, “Fəthul-bari fi şərhi səhihil-Buxari”. (Beyrut, Darul-marifə mətbəəsi)
62. İbrahim bin Muhəmməd Cuveyni əş-Şafei, “Fəraidus-simteyn”. (Beyrut, 1400 h.q.)
63. Şərif Murtəza, “əl-Fusulul-muxtarə”. (Beyrut çapı)
64. Seyid Əbdulhüseyn Şərəfuddin Amuli, “əl-Fusulul-muhimmə fi təlifil-ummə”.
65. Əli bin Muhəmməd bin Səbbağ əl-Maliki, “əl-Fusulul-muhimmə fi mərifətul-əimmə”. (Darul-hədis mətbəəsi. 1422 h.q.)
66. Əhməd bin Əli Cəssas, “əl-Fusulu fil-usuli”.
67. Muhəmməd Əbdurrauf əl-Munavi, “Feyzul-qədir”. (Beyrut. Darul-kutubil-ilmiyyə mətbəəsi.)
68. Həsən bin Fərhan əl-Maliki, “Qiraətun fi kutubil-əqaid”. (Əmman, 1421 h.q.)
69. Muhəmməd Hüseyn ət-Təbətəbai, “əl-Quran fil-islam”.
70. Əllamə Hilli, “Qəvaidul-əhkam”.
71. Əbu Talib əl-Məkki, “Qutul-qulub”. (Beyrut. Darul-kutubil-ilmiyyə mətbəəsi.)
72. Muhəmməd bin Yəqub əl-Kuleyni, “əl-Kafi”. (Tehran çapı)
73. Əli bin İbnulkərəm bin Əsir, “əl-Kamil fit-tarix”. (Beyrut. Dar Sadir. 1386 h.q.)
74. Əli bin İsa Ərbili, “Kəşful-ğummə”. (Beyrut. Darul-əzva mətbəəsi)

75. Əbu Bəkr bin Xətib əl-Bağdadi, “əl-Kifayə fi ilmid-dirayə”. (Beyrut. Darul-kutubil-ərəbi. 1405 h.q.)
76. Şeyx Səduq, “Kəmalud-din və təmamun-nimə” (Qum çapı)
77. Muhəmməd bin Kərəm bin Mənzur, “Lisanul-ərəb”. (Beyrut. Dar Sadir mətbəəsi.)
78. Əhməd bin Həcər əl-Əsqəlani, “Lisanul-mizan”. (Beyrut. Darul-marifə mətbəəsi)
79. Əhməd bin Muhəmməd əl-Bərqi, “əl-Məhasin”. (Tehran çapı)
80. Əbulfida, “əl-Muxtəsər min Əxbaril-bəşər”. (Qahirə çapı)
81. Əli bin Hüseyn əl-Məsudi, “Murucuz-zəhəb”. (Beyrut. Darul-marifə mətbəəsi)
82. Əhməd bin Hənbəl, “Musnədu Əhməd”. (Beyrut. Dar Sadir mətbəəsi.)
83. Əli Bəhbəhani, “Misbahul-hidayə fi isbatil-vilayə”. (Əhvaz, İran)
84. Muhəmməd bin Təlhə əş-Şafei, “Talibus-suul”. (Ummul-Qura Universiteti, 1420 h.q.)
85. Həsən bin Fərhan əl-Maliki, “Abdullah bin Səəd ilə”. (Əmman. 1422 h.q.)
86. Süleyman bin Əhməd ət-Təbərani, “əl-Mucəmus-səğir”. (Beyrut. Darul-kutubil-ilmiyyə mətbəəsi.)
87. Şəmsəddun Muhəmməd əz-Zəhəbi, “Mucəmu şuyuxiz-Zəhəbi”. (Beyrut. Darul-kutubil-ilmiyyə mətbəəsi. 1413 h.q.)
88. Muhəmməd bin Abdullah Hakim ən-Nişapuri, “Mərifətu ulumil-hədis”. (Beyrut. 1400 h.q.)
89. Hüseyn bin Muhəmməd Raqib əl-İsfəhani, “Mufrədətu ğəribil-Quran”.
90. Əbulfərəc əl-İsfəhani, “Məqatilut-talibin”. (Nəcəf. 1385 h.q.)
91. Muhəmməd bin Əli bin Şəhru Aşub, “Mənaqibu Ali Əbi Talib”. (Nəcəf. 1376 h.q.)
92. Zubeyr bin Bəkkar, “əl-Muvəffəqiyyat”. (Beyrut çapı)
93. Muhəmməd bin Əqil, “ən-Nəsaihul-kafiyə”. (Qum çapı)
94. Xəlil bin Əybək əs-Səfədi, “əl-Vafi bil-vəfiyyat”. (Beyrut. Dar ihyaut-turasil-ərəbi mətbəəsi.)
95. Muhəmməd bin Həsən Hurr Amuli, “əl-Vəsail”. (Qum çapı)
96. Süleyman bin İbrahim əl-Qunduzi əl-Hənəfi, “Yənabiul-məvəddə”.